




*Тофиг Јусиф*

# Бир талеһин көјнәмләри

**REDAKORU RAMİZ XASIOĞLU**

**TOFİQ YUSİF**

# BİR TALEYİN GÖYNƏMLƏRİ

**"Bir talehin göynəmləri" Tofiq Yusifin gün işığı görən ilk poetik duyğular toplsudur. Təbiətin yaratdığı möcüzələrə heyranlıq, Vətən sevgisi, Azərbaycanın ovsunlu musiqisinə heyrət, bir şair ömrünün əzabları, məhəbbətin ilahiliyi, xalqın qanını soran zəli xislətli vəzifə sahiblərinə qarşı sonsuz və ovxarlı nifrət bu kitabda cəmlənmiş şerlərin əsas qayəsi və cövhəridir.**

**S Səda, 1993**

## *TƏBİƏTİN OVSUNU*

### DUMAN

Duman təbiəti qısqanır bizə–
Gözə görünməyir nə dərə, nə dağ.
Uzaq bir səfərə gedən sürücü
Yəqin ki, bu gecə çöldə qalacaq.

Dağlar bu dumanla mehir göndərib,
Bilib ki, soyuğa dözməz pöhrələr.
Sehrli dumanı geyinib qızlar,
Gözə görünmədən görüşə gələr.

Qarğayıb çiskinə, çənə, dumana
Ovçular əliboş geri dönəcək.
Meşənin ətrini yığıb qoynuna
Bu duman arana pay endirəcək.

**1972.**

### DƏLİ DAĞ

**Şamil Əsgərova**

İldırımlar daraqlanar daşında.
Palıd qorxub bitə bilməz qaşında.
Bu dağları cəm eləyib başında
O göyləri azca yağdır, azca sağ,
Dəlidağ.

Çökən duman–gündüzlərin gecəsi,
Buz bağlayar yayda çoban keçəsi.
Yay qurtardı, payız oldu köçəsi,
Yaşılını saxla yaza, geyin ağ,
Dəlidağ.

Üşüyəndə güneyini geyindim,
Quzeyinə yönüm düşdü, keyindim.
Dumanında itdi yolum, döyündüm,
Bilmədim ki, hara soldur, hara sağ,
Dəlidağ.

Qıymazsan ki, söz sarıdan tükənim,
Çən hasarı dörd yanımdan sök mənim.
Dodağımla bulağına söykənim,
Ürəyimə qurtum-qurtum süzül, ax,
Dəlidağ.

**1974.**

## OCAQ

Bir qayda dara cəkər zülməti,
İşığıyla pardaqlayar gecəni.
Üzük kimi şölə saçar yamacda–
Nişan taxıb adaxlayar gecəni.

Bir tütəyin azıb qalan sədası
Alovlanıb, qaranlıqdan od asıb.
Səksəkənin ciyərinə od basıb,
Kösövüylə yaraqlayar gecəni.

Layladırmı dodağından çağlayır? —
Mürgü döyüb kar qayalar laxlayar.
O tay-bu tay qaranlığı bağlayar,
Bir yamaca çataxlayar gecəni.

İstəyini istilədər, gözlədər,
Arzusuna əlin dəysə, gizildər.
Günəş çıxsa işığını gizlədər,
Öz külündə soraqlayar gecəni.

Tapılıbdır ulduzlara bir bacı,
Yanağı od, hörükləri nur tacı,
Özü boyda qaraldaraq yamacı,
Gündüzlərə pay saxlayar gecəni.

**1975.**

## PAYIZLA QIŞ ARASINDA

Bir qəzəl beytiydi durna dəstəsi,
Qərib nəğmə kimi dillənib getdi.
Dərəyə sallandı çən şəlaləsi,
Qaya daraqlarda tellənib getdi.

Töküldü gözündən qəhəri göyün —
Bir ulduz itirib nazlı, ərköyün.
Dağı qaysaq tutdu üzündə gölün —
Sonası fəryad tək millənib getdi.

Günlər kədər kimi — şaxtalı, bumbuz...
Qışa busə verdi yanağından qız.
Qısqanıb dünyanı taladı payız,
Dağdan düzə endi, çöllənib getdi.

Dondu təbiətdə şənlik, çal-çağır,
Yaylağın yoluna ağ həsrət yağır.
Payızın köçünə bələdçi cığır
Qışın tufanında bellənib getdi.

Gəlinlik paltarı biçildi çaya,
Meşə ağ geyimdə gələcək toya.
Bezdi dəli yellə güştüdən qaya —
Yurdunu tərkitdi, hellənib getdi.

Gündüzün əlində qar-qiyaməti,
Gecənin çiynində nağıl səbəti,
Sözlü qocaların şirin söhbəti
Məcraya sığmadı, sellənib getdi.

Yarpaqsız tənəklər çoban çatısı,
Çoban torpaqdanmı şələ tutası?!
Mürgülər tütəyin yaz bayatısı,
Nəğməli bulağı lillənib getdi.

«Segah» hönkürtülü tar oldu günlər,
Soyuqdan üşüyüb daladı günlər.
Sönən həyat kimi saraldı günlər,
Ömrümə əl etdi, yellənib getdi.

Havadan azaldı xəzəl qoxusu,
Tutdu dərələri ağ qış yuxusu.
Günəşi bürüdü azmaq qorxusu —
Gözləri üfüqə zillənib getdi.

Ovçunun ocağı — kahaya qəlyan,
Qışla döyüşdəydi hər tərəf, hər yan.
Nəfəsi təngiyib yıxıldı ceyran,
Al qanı buz üstə göllənib getdi.

Payızın qəlbində qışın sitəmi,
Geri çəkilirdi məğlublar kimi.
Öpdü pəncərəmdən ayrılıq dəmi,
Nəfəsi şüşəmdə güllənib getdi

**1977.**

## TORPAQ SEVGİSİ

**75 yaşlı bağban Abbas**
**Hüseynova ithaf edirəm.**

Kötük barmaqında ovsun qaynağı —
Quru çöp gül açar dəysə bu əllər.
O elə sevir ki, daşı, torpağı,
Kor gözün işıqı sevdiyi qədər.

Loğman təbiətin dilini tapıb —
Bilir çiçək dili, bilir ot dili.
Onun nəfəsinə yaz nuru hopub,
Dəysə, pöhrələrin qalmaz niskili.

Ürəyi neçə il zamanı yorsa,
Çiçək dənizində çağlayasıdı.
Duyğusuzun biri bir fidan qırsa,
Oturub uşaq tək ağlayasıdı.

Zəhmət ocağında elə bişib ki
Ömrü vaxt selində çox çətin sına
Ürəyi o qədər zərifləşib ki
Dönüb qızılgülün bir parçasına

Bir ümman yaşıllı nəğmə yaradıb–
Göydələn çinarlar zil pərdəsidir.
Səsində elə bir həzinlik yatıb
Sanki yarpaq səsi çiçək səsidir.

Göylərin buludu qəzəbdən dolsa,
Qayğısını çəkər yarpağin belə.
Qışın sazağında imkanı olsa,
Sərilər üstünə torpağın belə.

Güllər cilvələnib budaqlarında,
Burda fəsillərin toyunu gördüm.
Onun bəslədiyi gül bağlarında
Payızla baharı qol-boyun gördüm.

Qisməti–quşların nəğmə leysanı.
Zövq alır, çiçəyin-gülün şehindən.
Taniya bilərmiş kolda insanı–
Düymələr dil açır ilıq mehrindən.

Qayğısı beləcə əriyib itər,
Dolanar hər kolun, gülün başına
Deyirəm, bəlkədə kök tutub bitər
Toxumu o səpsə çaylaq daşına.

**1981.**

**Şəlalə**

Havalanıb bu dağların həvəsi,
Havalanan haray kimi, qıy kimi.
"Cahargah"ın "Mənsuriyyə" zirvəsi,
Dərələrin bu dünyaya sözümü?

Yaranıbdı cəngilərin cəmindən,
İgidlərin nərəsi göy silkələr.
Bu sədanın izi ilə gələn çən
Ovsunlanıb elə burda mürgülər.

Koroğlunun dəliləri yoldadır...
Burda coşan Xan Eyvazın hirsimi?
Qamarlayıb sal qayanı fırladır
Haçaquyruq şeşpər kimi, gurz kimi.

Nağıllıymış bu dərənin qucağı,
Muğamları hardan yığıb qoynuna?
Fatma nənə yeddirəngli qurşağı
Dolayıbdı bu gözəlin boynuna.

Zirvələrin güzgülənən çagıdır–
Büllur saçı axıb gedir əlindən.
Nə qədərki "nazı yer-goy dağıdır",
O qədərdə asılacaq telindən.

**1981.**

## XƏZƏLƏ OD VURUR QOCA BİR QARI

Bu qızıl payızın üzü sapsarı,
Yaşıllıq köçübdür ev güllərinə.
Xəzələ od vurur qoca bir qarı,
Od vurur payızın son günlərinə.

Çalır dəli külək vida zəngini,
Yarpaq naxışlıdır çaylar, bulaqlar.
Sanki yumaq üçün sarı rəngini
Sulara tökülüb çimir yarpaqlar.

Payızın qoşduğu sarı nəğməyə
Yaşıl zəngulədir şam ağacları.
Sarılıq bir qucaq azalsın deyə
Xəzələ od vurur qoca bir qarı.

Pozulub meşənin yaşıl düzümü,
İtirib nazını bağçalar, bağlar.
Payızın sonuncu ümidi kimi
Yellənə-yellənə düşür yarpaqlar.

Bu qoca qarının fikri dolaşıq,
Ömrün payızını yaşayır indi.
Bir vaxt gözlərində yanan gur işıq
İndi köçüb gedən payız kimidi.

O da gəncliyində nurlu yaz idi..
(Keçmişdən nələri yadına salıb?).
Onun da yarpağı oğul-qız idi,
İndi çinar kimi yarpaqsız qalıb.

Süpürür xəzəli fikirli, dalğın,
Qolları avar tək gedir, qayıdır.
Onun da bənizi payız tək solğun —
Payızla elə bil ekiztayıdır.

Titrək xəzəllərə od vura-vura
Qarı bu payızı odlayacaqdı.
Bu qışdan, kim bilir, gələn bahara
Ağaclar, yoxsa o adlayacaqdı?

Payızın qoşduğu sarı nəğməyə
Yaşıl zəngulədir şam ağacları.
Sarılıq bir qucaq azalsın deyə
Xəzələ od vurur qoca bir qarı.

**1981.**

## KƏNDDƏ NOVRUZ BAYRAMI

Axşamın sevinci od tutub yanır —
Bayram tonqalları qanada dönür.
Birinin istəyi oddan tullanır,
Bütün kənd uşağı inada dönür.

Nə yaxşı bir ümman el yığnağından
Bu sısqa çeşməmiz yaşayır hələ!
Qorxmasa o yanda yıxılmağından
Tonqaldan hoppanar qocalar belə.

Bu gecə sözlərə sığal çəkilər,
Açılar gənclərin küsü düyünü.
Bir qızı yorubdu «bir az gözlə»lər,
Xınaya bükəcək bayram gününü.

Budaqlar bürünər yaşıl sevincə,
Göyərən səməni kövrək arzudur.
Gəlin gətirərlər yazı bu gecə,
Bu qız fəsillərin nazlı qızıdır.

Dərdli sinələrin ovunar qəmi,
Tonqaldan tullanıb gələr bu bahar.
Bu gecə bir nəhəng çılçıraq kimi
Kəndi dağ döşündən asıb uşaqlar.

Yanan şam Leylini gətirər yada...
Bahar nəğmələri tükənib bitməz.
İçəri atılmış iri torba da
Bayram sovqatını almasa getməz.

Qapı arxasından söz pusub biri
Qəlbində xoş niyyət tutub sınayar.
Qırmızı yumurta uduzub biri
Bu işdə toyuğu günahkar sayar.

Elə bil düşübdü kəndlərin bəhsi:
«Görək qaranlığı kim yandıracaq?».
Bu gecə yatmayan uşaq həvəsi
Sabah siniflərdə mürkü vuracaq.

Oxuyurdu bahar dərə dolusu —
Şəlalə simliydi bu gün qayalar.
Bu yazın əlində bulud dolu su —
Qorxurdu düz-dünya birdən od alar.

"Çiçəyi çırtlayar" nişanlıların —
Xonçalı gündüz var, görüşlü axşam.
Sinəmdə sevinci gələn baharın,
Ömrün payızıyla qucaqlaşmışam.

Bayram saxlancıdır süfrələrdəki,
Gizli düyünçələr açılıb təmiz.
Balınca söykənən babalar təki
Yaza söykənibdir indi kəndimiz.

Təbiət geyinir yaşıl kürkünü,
İtiyi qayıdır göy meşələrin.
Dözməyib altında ətir yükünün
Boynu bükülübdü bənövşələrin.

Kənd — şamlar düzülmüş xonçaya bənzər,
Dağlar qaldırıbdı qoları üstə.
Bu gecə kəndimiz səhərə qədər
Baharı gözləyər yolların üstə.

**1982.**

## QARABAĞIN DAĞLARI

*Məmməd Aslana*

Bulaqların dodağından bal əmdim,
Bahar yüklü dumanına bələndim.
Dərələrə ovsar cığır — bələdçim,
Vurğun kimi dəlisiyəm dağların.

Büdrəyəndə bir şam tutdu əlimdən,
Qövsü-quzeh toxunubdu külündən.
Yüz bayatı gürşad olar dilindən,
Nəğmə yüklü şələsiyəm dağların.

Uşaqlığım hələ ordan teylənər,
Qartalları sorağımla göylənər.
Ayaqlarım çəhlimində keylənər —
Arzusunu biləsiyəm dağların.

Hər çiçəyi ətir dolu mücrüdür,
Qayaları Çənlibelin bürcüdür.
Qolumdakı nər palıdın gücüdür,
Cökəsiyəm, vələsiyəm dağların.

Ovsun hopub torpağına, daşına,
Qəhərlənər duman ensə qaşına.
Dolanaram hər kolunun başına,
Kərəmiyəm, Lələsiyəm dağların.

Çeşmələrin hər damcısı — qızıl su,
Ürəyimdir itkin düşən quzusu.
«Xarı bülbül» — Natəvanın arzusu,
Nərgiziyəm, laləsiyəm dağların.

Əsəbində əsrlərin yükü var,
«Ərim gəldi» qayasıdır dik divar.
Hələ ömrün enişi var, diki var,
Səcdəsinə gələsiyəm dağların.

Gözəlliyi ürəyinlə çıx ovla,
Bulaqların hörüyüdür bu novlar.
Sarmaşığı nahaq məni buxovlar–
Mən onsuz da köləsiyəm dağların.

Orda bulud zirvələrdən aşağı,
Yeddirənkdir şəlalənin qurşağı.
Gözlərimdə gecəsinin işığı–
Bir ulduzluq şöləsiyəm dağların.

...Çat dodağım buz suyuna təşnədir,
Ürəyimdə dəli həvəs kişnədi.
O dağlarsız mənim ömrüm heçnədi,
Qucağında öləsiyəm dağların.

**1983.**

**“GECƏ GÜNDÜZ ÇİÇƏYİ”**

Bir qucaq mirvari asıb boynundan
Şeh içində nazla çimər bu çiçək.
Günəşi görəndə açan ləçəklər
Qısılar bir yerə Günəş batan tək.

Günəşlə birlikdə yuxudan durub,
Şehli gözləriylə seyr edir onu.
Mənə elə gəlir bu gözəl çiçək
Günəşə vurulub — o, sevir onu!

**1971.**

## MEŞƏNİN PAYIZI

Təbiət meşədə başlayıb toyu,
Torpaq əllərinə xına yaxıbdır.
Bir yarpaq qısalıb meşənin boyu,
Buz bulaq naxışlı eynək taxıbdır.

Sanki alovlanır meşənin içi,
Kəsilib quşların çal-çağırları.
Elə bil kimisə azdırmaq üçün
Xəzəllər gizləyib dar cığırları.

Qışın nəfəsidir payız küləyi,
Nəğməli dilləri tökür meşədə.
Yazın toxuduğu yaşıl örpəyi
Payız ilmə-ilmə sökür meşədə.

**1971.**

## DƏRƏLƏR

Dağın üz-gözünü cırıb ildırım,
Dərə — ildırımın qəzəb məskəni.
Hiddətli sellərdən dağ şırım-şırım,
Sellər — bədöy köhlən, dərə — yüyəni.

Dərələr — keçmişdən qalmış qalalar,
Zamanmı yoğurub, yapıb daşları?
Dağın gözüdürsə yaşıl talalar,
Dərələr — dağların çapıq qaşları.

Sal-sal qayalarla sellər elə bil
«Çırtmadaş» oyunu oynar dərədə.
Bu gur səs dərənin öz səsi deyil,
Dağların nəğməsi qaynar dərədə.

Duman dərələrdə gizlənər, yatar,–
Dərə düzə dönər sirli ovsunda.
Burada dəlisov elə qartal var
Hirslənsə zirvəni ovar ovcunda.

Dağlar qayalara söykənir, durur —
Qayalar dağlara əsa olubdur.
Görsəniz göylərdə qartal qıy vurur,
Bilin ki, dərədə nəsə olubdur.

**1971.**

## CIĞIRLAR

Neçə bulaqların gözündən içib!...
Cığırlar yolçuya bələdçidirmi?
Sıldırım dərədən, təpədən keçib,
Dağa sarmanıbdı aşiqi kimi.

**1972.**

## ÇOBANDIR DAĞLAR

Mənə elə gəlir çobandır dağlar,
Şimşəyi çiyninə sıxıb çomaq tək.
Tufanda sürüsü azmasın deyə
Kaha dodağında dillənir tütək.

Buludları qəfil şaqqalar şimək–
Çəkər yapıncıdan çomağı dağlar.
Sellər daş sürünü çoban iti tək
Qatıb qabağına dərəyə qovar.

Üstü bər-bəzəkli dəsmal yerinə
Qoyar döş cibinə Qaraquşu dağ.
Duman qayğı kimi tutub gözünü–
Olmaya bu kecə yağış yağacaq?

Gecə canavarla vədələşəndə
Dağlar yatmayıblar səhərə qədər.
Balınc təpələrə dirsəklənərək
Səksəkə içində mürgü döyüblər.

Sıxar qar papağı gözləri üstə,
Yellənər çən şərfi külək əsdimi.
Dar gündə arxadır biri-birinə
Dağlar qədirbilən çobanlar kimi.

**1973.**

## BAHAR SEVGİSİ

Cilvəli dərədə toy büsatı var —
Dağ məktub göndərib xına daşında.
Kəndin söz-sovundan qaçıb cığırlar
Qolboyun olublar bulaq başında.

Subayların səbri tamam tükənib,
Çəmənə cüt çıxan qızlar təklənib.
Bir bulud zirvəyə elə söykənib
Sanki dağ düşünür əli qaşında.

Yenə şirinlənib nazlı kölgələr,
Qan coşar, ürəyi sevgi silkələr.
Görüşlər axşama bürünüb gələr,
Gələr büllurlanıb yaz yağışında.

Qocalar əsanı söykəyib küncə,
Gözlüyü çıxarıb qoyublar dincə.
Bir az qıvraqlaşıb onlar da məncə
Ömür zirvəsinin ağ yoxuşunda.
**1978.**

## GÖZƏLLİK DÜNYASI

Bura yaşıl möcüzədir, möcüzə,
Heyrətimin zirvəsinə çatmışam.
Oturmuşam bir bulaqla diz-dizə,
«Segah»ının ovsununa batmışam.

Meşələri nəğmə dolu dünyadı,
Dərə var ki, eşitməyib gün adı.
Bir gözəli məni yaman qınadı —
Ürəyimi təbiətə satmışam.

Talaların göz muncuğu — bulaq var,
Gül-çiçəyi dizlərimi qucaqlar.
Məni elə sehirləyib bu dağlar
Bilməmişəm, ayaq üstə yatmışam.

**1986.**

## AZƏRBAYCAN MUSİQİSİ

**Azərbaycan musiqisi**

Musiqi leysanı yağır otağa,
Qolunu qaldırıb oynayır uşaq.
«Ana» kəlməsini söyləyə bilmir,
«Vağzalı» havası sındırır ancaq.

Nəğmədən yoğrulur ürək bu yurdda,
İstəsən mahnıya çevrilər torpaq.
Öz ana dilini öyrənməmişdən
Musiqi dilini öyrənir uşaq.

**1973.**

## QABOYUN SƏSİ

**Qaboyçalan Kamil CƏLİLOVA.**

Axar bir bulağın həzin nəğməsi,
Axar ürəyimə, süzülər keçər.
Qaboyda odlanar bir bülbül səsi,
Qaboyda yaralı ceyran su içər.

Otağım bir dərin ümmana dönər,
Üzərəm nəğmənin həzinliyində.
Uzaqda bir ulduz əriyər, sönər,
Sönər bu nəğmənin sərinliyində.

Gah tufan eləyər, kah ocaq çatar,
Bir anda üşüyər, yanar bədənim.
Qaboyda qanımın istiliyi var,
Qaboyda çalınan qəlbimdir mənim.

...Dindi babaların bayatıları,
Bu səsdən buzunu əritdi torpaq.
Bu səsdə mehrini duyub baharın
Erkən puçurladı budaqda yarpaq.

**1974.**

## “YALLI”

Bir kəndin gileyi itdi, əridi,
Qolboyun elədi ahıl-cavanı.
Çubuqların səsi —nağıl səsləridi,
Nağara — bəzənmiş cıdır meydanı.

Utancaq gözəllər pozdu sükutu,
Sevən ürəklərin əridi dərdi.
Dağlar zirvəsinə qoyub buludu
Nəhəng məcməyidə xonça gətirdi.

Nağarayla qışa ayaqlar dindi,
Oynadı qocanın sümükləri də.
Əlini dizinə çırpıb deyindi:
«Heyif cavanlıqdan, qaldı geridə!».

«Yallı»nın sədası göyə də çatıb–
Səmada ulduzlar ovsunlanıblar.
Zurna neyləyibsə köynəyi atıb,
Həyalı ağaclar lüt dayanıblar.

Sevgidir zurnada çağlayan, coşan,
Subaylıq evimi yıxdı ürəkdə.
“Yallı” havasında dağ aşar duman,
“Yallı” havasında əsər külək də.

**1974.**

## KAMAN

Yatıbmış zamanın dərdi sinəndə,
Dindin, ürəyimi qanatdın, kaman.
Bürünüb həsrətin hönkürtüsünə
Bizi qəm selinə sən atdın, kaman.

Hardasa bir qərib ana ağladı,
Fəryadlı könlündən qəhər çağladı.
Hıçqırtın sinəmi yaman dağladı,
Mürgülü dərdimi oyatdın, kaman.

Bu səs bir ovsundur, bu səs, səs deyil,
Yenə də unudub özünü Habil.
Ağlayıb, ağlayıb, susdun... elə bil
Kədərə qısılıb sən yatdın, kaman.

**1972.**

### "YANIQ KƏRƏMİ"

Vallah, Ədalətdir bu oda dözən,
Heç kəs dözə bilməz, bu, elə qəmdi!
Sazın tufanında Əslini gəzən
Ay, Ədalət, sənsən, yoxsa Kərəmdi?!

**1971.**

## SEVGİ NƏĞMƏLƏRİ

### GƏLMİSƏN...

Gəlmisən...
Gözümdə yaş giləl追nib,
Şoruşma: "Gözlərin nə dolur belə?"
Sənin yoxluğundan donmuş intizar
Mehrindən əriyib yaş olur belə.

**1970**.

### GÖZLƏRİNİ DÜYMƏLƏ

Sən çiçək təşnəsi, gül şəhidisən,
Elə yanağın da gül butasıdır.
Ocaq gözlərinin girinə keçən
Yazıq Kərəm kimi od tutasıdır.

Çiyələk dodağın təzə dənzərib,
Hördüyün hörükdür, yoxsa Gün zəri?
Tapılmaz hüsnünə işıq bənzəri —
Ulduz hikkəsindən çatdıyasıdır.

Kirpiyinlə gözlərini düyməlo,
Bu od-ocağına dözər kim elə?
Dəlisov bir gəncə azca him elə,
Qayanın dizini qatdıyasıdır.

Heyif, sovrulmuşam vaxt axarında!...
Həsrətimə desən, qışın qarında,
Qaya çarpanağı dırnaqlarında,
Quşqonmaz dağları addıyasıdır.

**1978.**

## MƏN SƏNİ İTİRDİM

Dərəyə dağılan əks-sədamsan,
Mən səni itirdim bir haray kimi.
Eşqin zirvəsinə çata bilmədin,
Döndün başqa səmtə bir dolay kimi.

Hicranın oduna dözmək çox çətin,
Bu, sənin qəlbinin işi deyildi.
Özülü çürümüş bir məhəbbətin
Divarı beləcə əyilməliydi.

Mənzilə çatdımı məqsədindəki?
Məkirli arzuna yetişmək üçün,
Burulğan üstündə addamac təki
Mənim ürəyimdən adlayıb keçdin.

Kim səni itirib-axtarasıdır?
Axtar, tap özünü xatirələrdə.
Ürəyin dağılmış quş yuvasıdır,
Perikmiş gümanın dönərmi bir də?

Kimsə öz nəfsini dolaşıq salsa,
Bəlkə bir gecənə gün düşəcəkdir?
Onu bilirəm ki, ocaq da olsa,
Qəlbinin buzundan üşüyəcəkdir.

**1979.**

## BU ŞİRİN YUXUNU NECƏ YOZAYDIM

Bu şirin yuxunu necə yozaydım?
Həsrətim toxtayıb bəxtəvərləndi.
«Kərəmi» odunda yanan sazıydım,
Ruhuma «Vağzalı» yoxdan çiləndi.

Həyatda yetmədim bu xoşbəxtliyə,
Bizi qovuşdurdu sirli yuxular.
Bəlkə də dərd-səri ovudaq deyə
Ömrün yuxu adlı möcüzəsi var?

Mənim bahar sevgim çoxdan kiriyib–
Ömrümün bağını payız talayır.
Sənin gülşənini cəh-cəh bürüyüb,
Mənim boz çölümdə bayquş ulayır.

Gəldi yuxularda əvvəlin sonu,
Bu şərbət beləcə içilməliydi.
Bizim toyumuzun gəlinlik donu
Elə yuxularda biçilməliydi.

**1982.**

## İMKANIM OLSAYDI...

Çəkib çıxartdın sən məni dərdimdən —
Qucağı beşik tək boş qaldı dərdim.
İmkanım olsaydı kirpiklərimdən
Ayaq izlərinə çəpər çəkərdim.

Hicranın əlində sarı simiydim,
Çalan da yox idi hönkürüm, dinim.
Mən ki, öz içimdə qərib kimiydim,
Özümü özümə qaytardın mənim.

Dəyişdi günümün, ayımın köçü
Sevinc yuva qurdu diləklərimdə.
İmkanım olsaydı bu qayğı üçün
Səni yaşadardım bəbəklərimdə.

Düşmüşdüm bir həsrət burulğanına
Sağalmaz dərd kimi qövr eləyirdim.
İmkanım olsaydı dönüb qanına
Səndə ömrün boyu dövr eləyərdim

**1982.**

## NƏ YAXŞI...

Xəyalımda mavi dəniz...
Sularında ay doğranıb cilik-cilik,
Sahildən uzaq qərib bir sakitlik.
Ulduzlar dənizin
ləpə ovuclarında noğul kimiydi.
Bu gecə dəniz nağıl kimiydi.
Xəyalımda mavi dəniz...
Ağ yelkənli bir qayıqda
üzürdük biz qağayı kimi,
Bir az əvvəl

bağrına basmışdı dəniz səni —
sıxmışdı dalğa qollarının arasında.
Ləpələlər dodaq-dodaq,
Saçların islaq-islaq.
Yanağından,
dodağından,
kipriklərindən,
saçından,
bütün bədənindən
öpüş damcılayırdı —
dəniz öpüşü.

Bu dəniz
elə bil çoxdan arzulayırmış bu görüşü.
Gözlərinin qarasında
dənizə vurğunluq vardı.
İmkanın olsaydı
qucaqlayıb özünlə aparardın.
Zirvələnmişdi həsədim,
Dəniz olmaq istəyirdim.
Sonra...
Çırpınıb çıxdın
dənizin qoynundan —
isti qucaqdan çıxanlar kimi.
Titrəyirdin şirin bir hissin altında.
Görünürdü bütün incəliklərin
Yamyaş, namnazik donun qatında.
Baxıb gözlərimin kövrəkliyinə,
Sığındın sinəmə,
ovutdun həsədimi.

Damarımda od tutdu qan.
Yaxşı ki, dəniz olmamışam,
Yaxşı ki, insanam, insan!
Bir də...
Yaxşı ki, xəyallar varmış
Yoxsa xəstələr dəli olarmış.

**1982.**

## SƏN MƏNİ SEVMİRSƏN

Sən məni sevmirsən,
Buna haqqın var.
Bu eşqi başına qaxacaqdılar.

Sən çiçək dağında çağlar bir çeşmə,
İllər çoxdandır ki, qurudub məni.
Sevgimdən bir kəlmə demirsən, demə.
Barı açıq denən sevmədiyini.

Daha bu qayqılar, yanmalar nədir?
Qəlbinin dediyi dilində dinsin.
Duymursan ürəyim yaman gündədir?
Denən, qoy sonuncu güman da ölsün.

Çox da ki, ümidim sənin əlində,
Çox da həsrətimdən yonulmuş dağsan.
Axı sən eşqimin zirvələrində
Qanadsız quş kimi çırpınacaqsan.
Sevmirsən?
Bir yolluq inandır, inan.
Əl çək ikiüzlü məhəbbətindən.
Bir yolluq üzülüm mən bu sevdadan.
Bir yolluq bilim ki, sevilmirəm mən!

**1982.**

## BƏNDDİR

Həsrətin sinəmdə ağrıya dönüb,
Sovuşar , mehirli bir naza bənddir.
Kövrək ürəyimə buludlar enib,
Acılar, günəşli, nur yaza bənddir.

Eşqinlə köklənən elə təbim var,
Çağlasa, heyrətdən dünya mat qalar.
Yallı» havasına düzülüb dağlar,
Dodağından qopan avaza bənddir.

Eşqin — ürəyimdə alınmaz qala.
Yorğun baxışlarım tökülüb yola,
Anam deyəndə ki, evlən, ay bala,
Deyirəm: — Ay ana, Gülnaza bənddir.

**1973.**

## NƏĞMƏLƏR

Sənli nəğmələrim ürək yanğısı,
Orda arzularım dil açdı, dindi.
Sənsiz nəğmələrim ürək ağrısı,
Sənsiz nəğmələrim qəribdir indi.

Bir daha qayıtmaz itən ümidin
Əlçatmaz uşaqlıq illəri kimi.
Sən mənim eşqimi yaradan idin,
İndi öz eşqimə yetim deyimmi?

Daha nə harayla, nə səslə məni,
Gözünü həsrətlə dikmə yollara.
Oxumaq istəsən sevgi nəğməni,
Oxu eşq yolunda ünvansızlara.

**1974.**.

## ÜRƏYİMİ QAYTAR

Həsrətim dondurub bəbəklərimi,
Gözümün buzuna heyrətmi etdin?
Budaqdan ayrılmış bir yarpaq kimi
Mənim ürəyimi qopardın, getdin.

Düşübdür tərsinə küləyin yönü.
İndi yağışlar da dəyişib yağar.
Bilməzsən gözlərim  ulduza dönüb
Sənin pəncərənə həsrətlə baxar,

Xatirə evindən elə gün olar
Qərib yolçu kimi məni qovarsan.
Sonuncu gümanım tək ona qalar,
Deyərəm: — Nə yaxşı, dünyada varsan!

Yalvarıb-yaxara bilmərəm sənə,
Gedənə yaxşı yol arzulayarlar.
Sənin ki, ürəyin qalıb özünə,
Mənim ürəyimi özümə qaytar.

**1974.**

## SƏNSİZLƏMİŞƏM

Günlərdən asılıb il ağırlığı,
Sənsiz hər saatım həftədir, aydır.
Büküb ürəyimə bu fağırlığı,
Sən mənə günləri beləcə saydır.

Gələr eşqimizin ətirli yazı,
Çiçəklər açılır dəstəbədəstə.
Atarsan bir yana qəmzəni, nazı
Məni saxlayarsan gözlərin üstə.

Cövrünə ürəyim əbədi məskən,
Əriməz ümidim, itməz gümanım.
Səni bu dünyaya dəyişməzdim mən
Əgər olmasaydı Azərbaycanım.

Sevgimin Məcnuna dönən çağında
Nəfəsini kəsib hicran yolunun,
Şirin vüsalının xumarlığında
Dolaram boynuma ipək qolunu.

Xəyallar fikrimi aparır hara?
Gözlərim önündə o dağ, o dərə.
Bir nəğmə qoşaram gedən qatara,
Təkərlər oxuyar sərnişinlərə.

Günlərdən asılıb il ağırlığı,
Sənsiz bir dəqiqəm həftədir, aydır
Büküb ürəyimə bu fağırlığı,
Sən mənə anları beləcə saydır.

**1975.**

## SƏNƏ MƏKTUB

Mən — səhra susuzu, sən — büllur bulaq,
Cadarlı dodağım üzünü cızar.
Toxunsam, sinəndə yanar gur ocaq —
Mənim nəfəsimdə vulkan odu var.

Qanımda bir tufan çağlayar mənim,
İldırım səsini içinə salar.
Qəlbimdə bir həsrət ağlayar mənim,
Zirvələr buluddan qara bağlayar.

Sinəmdə arzular pərəndən-pərən –
Saçınmı dağılıb küləkli gündə?
Yazıq ürəyimi neçə kərə mən
İtirim gözündə, tapım gözündə?!

Yuxum xəyalının gözümə rəhmi,
Yuxum qanadında gətirər səni.
Ana balasını qoruyan kimi
Ürəyim qoruyar məhəbbətini.

Mən sənin eşqinlə işığam, nuram,
Bu sevda könlümdə çırpınır quş tək.
Sinəmi qayaya toxundurarsan
Eşqimdən od alıb eşqə düşəcək.

Bəxtim xəcalətdir öz günahından –
Nə qədər qaralıb, yazıqlaşıbdır.
Qorxub həsrətimin Kərəm ahından
Ulduzlar daha da uzaqlaşıbdır.

**1976.**

## GƏL QURTAR ÖMRÜMÜ KƏDƏR ƏLİNDƏN

Daha gözləməyə tabım qalmayıb,
Gəl qurtar ömrümü kədər əlindən.
Tanrı talehimə nəzər salmayıb —
Könlüm aman çəkir qədər əlindən.

Çoxunun düz yolu sığallı, hamar
Tikanlı cığırım dağa dırmanar.
Sıxsan ürəyimi hicranın damar —
Göz yaşına dönüb qəhər əlindən.

Soyuq xəzri əsir cavan bağımda,
Payız xəzəliyəm bahar çağımda.
Sinəmin zəqqumu dil-dodağımda —
Qaçmağa yerim yox zəhər əlindən.

Diz çökdüm günlərim havayısında,
Arzum qara keyib ümid yasında.
Ömrüm xəstəxana çarpayısında
Tükənir bir nurlu səhər əlindən.

**1982.**

## .ÜSTƏ

Sən elə bilirsən uzaqlığınla
Yağışa dönərsən gözümün üstə?
Elə bir qışsan ki, sazaqlığınla
Ocaq qalayırsan dözümün üstə.

Sənsizlik içində səninləyəm mən,
Xəyalın çiçəkdir, baxışım çəmən.
Eşqin bəbəyimə çevrilən gündən
Döndün kipriyimə gözümün üstə.

Hicran uzaqdısa, vüsal şirindi,
Özüm özüm boyda sevgiyəm indi.
Deməərəm vurduğun yara dərindi
Yüz il xəstə yatsam üzümün üstə.

İllərdən ağırdır hicran ayları,
Təklikdən qıvrılır dağ dolayları,
Arazdan savayı bütün çayları
Bağlayın ayrılıq sözünün üstə.

**1982.**

## ALDANMIŞAM

Gərək sevməyəydim...
Bu, mümkündürmü?
Gah nazlı baharsan, Gah qarlı qışsan.
Sən məni yandırıb bir ocaq kimi,
Sonra... kösövümü tapdalamışsan.

Donan yaş deyilmiş kipriklərində,
Saxta ürəyini göstərdin demək.
Gərək yanmayaydım...
Yandım əlində,
Sonra da atıldım kibrit çöpü tək.

Yarım kül olsa da, hələ yarım var,
Yaşamaq arzumdan əlim üzülməz.
Nə yaxşı yarıkül arzularım var,
Tamam kül olmuşlar nə etsinlər bəs?!

Nə yaxşı, nə yaxşı isbat elədin
Sənin sevincin də, qəmin də qəlpmiş!
Donuq ürəyində dünyadan gizlin
Dönüklük mərmisi qəlpələnibmiş.

...Ömür zülmə dönür, həyat zindana
Ürək itirəndə ürəkliyini.
Sənin dönüklüyün qalsın bir yana,
Mənim aldanışım yandırır məni!

**1982.**

## QIYYALAR

Gözlərindən nə kədərdir çağlayan?
Bir ah çəksən, dəli könlüm qıy alar.
Qoca qartal zirvələrdə qıy vursa,
Dərələrdən püskürəcək qıyyalar.

Ovçu gözüm ürəyini ov andı,
İntizarın sevincimi ovandı.
Puç olanda arzuların ovandı
Yazıq qəlbim haray əmər, qıy yalar.

Bəxtin gülər, Tofiq, səni yar ansa,
Xoşbəxtsən ki, yar yarası yaransa.
Eşqimizdən bir qalacıq yaransa,
İnsafdımı bu sevgiyə qıyalar?

**1982.**

## GETDİN...

Daha həsrətindən uzanmaz günüm,
Daha eşqimin də inadı keyib.
Sevdası puç olan ürəyim mənim
Bir daha sevməyə tövbə eləyib.

**1982**.

## GƏLMƏDİN...

Gözlədim yolunu bu gün nə qədər!
Gəlmədin.
Neyləyə bilərdim ki, mən?
Dünən gətirdiyin tər bənövşələr
Dikələ bilmirdi xəcalətindən.

Gözlədim...
Gözlədim...
Gün axşam oldu,
Gəlmədin,
Bu sənin istəyin idi.
Gözlədi...
Gözlədi...
Saraldı, soldu,
Yazıq çiçəklərin günahı nəydi?

**1982.**

## GƏLDİN

Gəldin...
Gəlişinlə gül açdı günüm,
İndi ümidim də çiçək-çiçəkdir.
Bir az toxtayacaq dəli olmuşam–
Ürəyim bir hovur dincələcəkdi.

Sinəmdə sazaqlı bir çovğunuydu,
Gəldin..
Gəlişinlə dünyam sevindi.
Gözlərim yollarda yol yorğunuydu,
İtiyi tapılmış uşaqdı indi.

Gəldin...
Əllərində bənövşə dəsti,
Bir yazın ətrinə bələndi könlüm.
Gəldin...
Gəlişinin məramı, qəsdi,
Hər nəsə, mən onun başına dönüm!

**1982.**

## ONDA BİLƏCƏKSƏN YAŞAMAQ NƏDİR

Sən hələ pohrəsən, mən–qoca çinar,
Yaşıl ümidlərin kövrəkdir hələ.
Mənim cövhərimdə qışa dözüm var.
Sənə yaz günəşi gərəkdir hələ.
Nə payız görmüsən, nə də soyuq qış,
Hələ bahar səni bağrına basıb.
Bəxtinə yağmayıb nə qar, nə yağış,
Arzun ulduzlardan yelləncək asıb,
Yanıb yaşamağa dözümün yoxdur,
Həyat sənin üçün xülyadır ancaq.
Bilirəm, dünyadan gözləncin çoxdur,
Ömür gözlərində röyadır ancaq.
Sən hardan biləsən yaşamaq nədir?

İnamın tunclanıb poladlanmasa,
İlləri gövdənə düyünləməsən,
Xəyalın ulduza qanadlanmasa,
Ucalıb göyləri çiyinləməsən;
Arzuyla, ümidlə budaqlanıb sən,
Torpağı özünə qala bilməsən;
Bir nəğmə eşqiylə dodaqlanıb sən
Küləyi heyrətə sala bilməsən;
Dərdin köklənməsə Araz üstündə,
Həsrətin sinəndən havalanmasa,
Məşəqqət çəkməsən muraz üstündə,
Gözündə qəm, kədər yuvalanmasa,
Hardan biləcəksən yaşamaq nədir?

Dizini torpağa söykəyib qalxsan,
Yapışsan Günəşin nur ətəyindən;
Bilsən ki, nəyisə qoruyacaqsan
Yalquzaq ağızlı qış küləyindən;
Yayın bürküsündə təngisən əgər,
Su içmək ümidin buluda qalsa;
Ömürlə davada ləngisən əgər,
Bir nadan yolunu yanından salsa;
Hələ bərkiməmiş, hələ bişməmiş
Həyat yollarında üşəndin bəlkə;
Nəyçün gəldiyini başa düşməmiş,
Nəyçün getdiyini düşündün bəlkə;
Onda biləcəksən yaşamaq nədir.

**1982.**

## NECƏ

Sənsiz arzuların qolları bağlı,
Qovrulmayım necə, qovrulum necə?!
Tükənib dilimin bahar nağılı,
Sovulmayım necə, sovulum necə?!

Bir hicran nəğməli dilə dönmüşəm,
Bayatı hönkürən telə dönmüşəm.
Elə yanmışam ki, külə dönmüşəm,
Sovrulmayım necə, sovrulum necə?!

Ürəyim çevrilib arzu köşkünə,
Bəxtimin bu hicran düşdü püşkünə.
Mən qala tikmədim, daxma eşqinə
Yoğrulmayım necə, yoğrulum necə?!

Göz yaşı — ürəyin həsrət hayıdır,
Sənsiz ömür yolum daq dolayıdır.
Sinəmdən kükrəyən Araz çayıdır–
Boqulmayım necə, boqulum necə?!
Eşqin havasına qəzəl olmuşam,
Sevdanda Məcnundan əzəl olmuşam.
Payızın ovcunda xəzəl olmuşam,
Ovulmayım necə, ovulum necə?!

**1982.**

## SƏSİNƏ MÖHTACAM

Bir vaxt titrək əlin ovuclarımda,
Bir vaxt hörüklərin şəlaləm idi.
Bir vaxt binə idim arzularında,
Səsinə, səsinə möhtacam indi.

O zaman bu dünya bizimdi ancaq,
O zaman ümidlər yetim deyildi.
Yalnız bizim idi o dərə, o dağ,
Səsinə, səsinə möhtacam indi.

Sığala yatmayır xatirələrin —
Gözümdə, könlümdə pərən-pərəndi.
Bir vaxt sənin idim, mən yalnız sənin,
Səsinə, səsinə möhtacam indi.

İndi aramızda keçilməz sədd var,
Günah həm sənindi, həm də mənimdi.
Bəlkə də qovuşdu kövrək arzular
Səsinin möhtacı olsam da indi.

**1983**.

## HARDASAN AY CAVANLIĞIM, HARDASAN?

***Bir az zarafatyana.***

Bu gözəllər indi məni saymayır,
Hardasan, ay cavanlığım, hardasan?!
Gözlərimsə gözəllikdən doymayır,
Hardasan, ay cavanlığım, hardasan?!

Ötən illər saçıma qar ələdi,
Xəstə qəlbim quzu kimi mələdi.
Mənim könlüm istək ilə silədi,
Hardasan, ay cavanlığım, hardasan?!

Bu dünyanın işi yaman uzundu,
Ömrüm-günüm təsəlliyə qızındı.
Bir söz dedim o gün, bir qız uğundu,
Hardasan, ay cavanlığım, hardasan?!

Gəlib yaşın qəm çağına çatmışam,
Bir gözəlin marığına yatmışam.
Özüm boyda bir həsrətə batmışam,
Hardasan, ay cavanlığım, hardasan?!

Nazlı qızlar ömrə qənim kəsildi,
Gözəllik ki, tez solan bir fəsildi.
Qocalıqla ötən illər nəhs ildi,
Hardasan, ay cavanlığım, hardasan?!

Gah ürəyim silkələyir ömrümü,
Gah bu sevda dara çəkir səbrimi..
Yanıb-söndün bir işımlıq köz kimi,
Hardasan, ay cavanlığım, hardasan?!

İndi mənə əmi deyir bu qızlar,
Arzularım için-için sızıldar.
Nə istəsəm dünya məndən qızırqar,
Hardasan, ay cavanlığım, hardasan?!

Subayların sultanlığı taxtında,
Günəş gülsün bu qızların baxtında!
Kaş gələsən yaşımın bu vaxtında!...
Hardasan, ay cavanlığım, hardasan?!

Ya qızların nazı belə çoxalıb,
Ya da mənim şair təbim yuxalıb.
Gur həvəsim köhlənindən yıxılıb,
Hardasan, ay cavanlığım, hardasan!

Qoca dünya, kim taxtından enməyib?
De kimlərdən sənin üzün dönməyib?
Ümidimin hələ odu sönməyib,
Hardasan, ay cavanlığım, hardasan?!

İllər ötər, ömür çıxar dayaza,
Bahar gedər, dünya qalar payıza.
Sevda itər, ürək düşər ayaza,
Hardasan, ay cavanlığım, hardasan?!

A gözəllər, yaz yuxunuz qarışsın,
Yarınızla ulduzunuz barışsın.
Bu şair də qoy elə hey soruşsun:
–hardasan, ay cavanlığım, hardasan?!

Bir vaxt siz də dizinizə döyərsiz,
Bir vaxt siz də belinizi əyərsiz.
Bir vaxt siz də Tofiq kimi deyərsiz:
«Hardasan, ay cavanlığım, hardasan?!».

**1983.**

## ANAMA

Bəzən uşaqlaşıb kövrəkləşirəm,
Anamın laylası yadıma düşür.
Deyirəm: bu günəş, bu ulduz, bu ay,
Görəsən anasız necə ötüşür?!

**1969.**

## ƏLİ KƏRİM ÜÇÜN

Kədərini bir daş kimi
qoyub ayağının altına
baxdın yollara.
Gözlədin sevgilini,
Gözlədin Paşanı, Azəri.
Sözlərini bir-birinə calayıb,
Dünyanın belinə dolayıb,
Çiyninə almaq istədin Yeri.
Ölümün Nəsimi zirvəsini kəşf etdin.
Getdin...
Dünya itirdi dünya boyda şairi.
Torpağın altına getdin ki,
çiyninə alasan Yeri.

**1974.**

## ATA HƏSRƏTİ SİLSİLƏSİNDƏN

## GÖYNƏM

Bir ata həsrəti sinəmdə ocaq,
Duyğumda elə bil od qalanıbdır.
Mən indi bilirəm atasızların
Qəlbində nə qədər arzu yanıbdır!

İldırım hirsindən düşdü dərəyə,
Qayanın bağrını yardı bu səda.
Bu torpağa borcun qalmasın deyə
Torpağın qoynuna köç etdin, ata.

Anamın göz yaşı dönübdür selə,
Neçə anaları ağladıb zaman!
Deyirəm, dünyada dənizlər elə
Bəlkə də yaranıb göz yaşlarından?!

Ölüm gözlə qaşın arasındaymış,
Ölüm—bir nəfəslik, ölüm — bir anlıq.
Məzarlar — ölümün ayaq izləri,
Bir addım yeridi qəbiristanlıq.

**1975.**

## *50 YAŞ*

50 yaş — dünyada gül açan bahar,
50 yaş — həyatın mənalı dərgi.
Əgər sən yaşında getsə adamlar,
Dünyanın yarısı köçüb gedər ki!..

Sənin bu ölümün əbədi deyil,
Mənim ürəyimdə yer salacaqsan.
Dünyanın çiynindən düşsə də min il,
Elə 50 yaşda sən qalacaqsan.

**1975**.

## YADİGAR

Meşənin dilində həzin bayatı,
Bulaq mahnısını gileyli çaldı.
Sən getdin, əzaba bükdün həyatı,
Sən getdin, yetimlik yadigar qaldı.

Sənsiz ev-eşiyə uyuşmaq çətin,
Sənsiz ömrümüzə dərd qalanıbdır.
Dönüb baş daşına kövrək həsrətin
Soyuq məzarından nidalanıbdır.

**1975.**

## GÖZLƏRƏM

Qəbrinin üstünün torpağı sarı–
Qorxub qucağına alanda səni.
Dişimlə didərəm ulu dağları,
Gözümə yığaram dumanı, çəni.
Sonra da gözlərəm...
Sorağın gəlməz,

Gözlərəm, gözlərəm, ürəyim dolar.
Gözlərəm, gözlərəm, dərdin əriməz,
Gözlərəm, gözlərəm, gözüm dörd olar.

**1975.**

## DÜNYA

Qəzəbim çağladı bəbəklərimdən,
Gözümdə mənanı itirdi dünya.
Bir də görürsən ki, çiçəyi yolub,
Yerində tikanı bitirdi dünya

Qəhərim sinəmdə dəstəbədəstə,
Arzu gorgahında ürəyim xəstə.
Pisləri saxladı gözləri üstə,
Yaxşını həyatdan götürdü dünya.

Adam var ürəyi illər yorğunu,
Əzabdır günlərin keyi, durğunu,
Vədəsiz apardı Səməd Vurğunu,
Yerinə kimləri gətirdi dünya?!

Elə sitəmliyə edib sitəmi,
Qurunun oduna yandırdı nəmi.
Gözümə, könlümə od kimi qəmi,
Bəxtimə yetimlik gətirdi dünya.

**1975**.

## ƏN UZUN GECƏ

Dəli tək başıma atıb səsimi
Çağırram yuxuda qalan səhəri.
Bu gecə ən ağır yaralı kimi
Sürünər, çiynine alıb göyləri.

Qəlbimdə neçə il qaladı ocaq,
Ömrümdən neçə il keçdi bu axşam!
Sabah dostlar məni tanımayacaq —
Bu gecə zamanı qabaqlamışam.

**1975.**

## GƏLDİN Kİ...

***Oglum Yusifə***

Bizim arzumuzdan göyərdin, oğlum,
Gəldin ki, atamı yaşadasan sən.
Gəldin ki, atanı yandırıb-yaxan
Ata həsrətinə daş atasan sən.

Çöhrən nə qədər də doqmadır mənə!
Təbiət bəxtini naxışlayıbmı?
Dünyadan əbədi köçəndə baban
Gözlərini sənə bağışlayıbmı?

Olmusan evimin gül yaraşığı,
Anam da mehrini salıb üstünə.
Adını çağırsa qonşu uşağı
Səksənib heyrətlə baxıram sənə.

Atamın uşaqlıq fotoşəklisən,
Belə oxşarlığa heyranam, matam
Oğlum, bu dünyaya gəlmisən ki, sən
Ömrünə yenidən başlasın atam.

**1977.**

## ANAM

Hiddətdə xəzridir, istəkdə mehdir,
Hirsini mehirdən yoğuran anam
Biz yetim qalandan yaralı neydir,
Qəlbini dərdində qovuran anam.

İlləri alnından yoğurub, yapıb,
Saçları ağarıb —ağ ömür tapıb
Yorğun gecəsini gündüzə qatıb,
Ömrünü kül edib sovuran anam

Gözünün işığı — göz yaşların,
Sevinci, şənliyi — tay-tuşlarında.
Həyatın ən ağır yoxuşlarında
Ata arzusunu doğuran anam.

Ona miras qalıb həcər qeyrəti,
İldırım eşitsə donar cürəti.
Bizi yandıranda ata həsrəti,
Yetimlik oduna su vuran anam.

**1977**.

## “QARDAŞ HEEEYYY”!!!
## SİLSİLƏSİNDƏN

Mən elə bilirdim ölərəm sənsiz,
Dağları üyüdüb ələrəm sənsiz.
Dünyanı qarğışa bələrəm sənsiz...
Qəbrin də dillənmir alışsın giley,
Qardaş, heeeyyy, qardaş, heeeyyy!!!

Gündüzüm əzabdır, gecəm sitəmdir,
İçdiyim zəhərdir, yediyim qəmdir.
Orda kimlər sənə dostdur, həmdəmdir?!
Oyan, niyə belə uzanıbsan key?
Qardaş, heeeyyy, qardaş, heeeyyy!!!

Nə pis bir vüsala yetişdi Vüsal!...
Gəl, qızın Könülün özün könlün al.
Yolunu ananın gözlərindən sal,
Anan doğma ana, qəbirsə ögey,
Qardaş, heeeyyy, qardaş, heeeyyy!!!

Ağrıya dözümün — yarpaq dözümü,
Yaranı sarıyıb torpaq özümü?
Qadan alım, yerə salma sözümü,
Qəbrini əynindən çıxar, həyat gey,
Qardaş, heeeyyy, qardaş, heeeyyy!!!

Tapşırıb getmişdi atamız səni!..
Necə ovundurum körpələrini?!
Bizi oda salma, aç gözlərini,
Bu kor ümidimin qapısını döy,
Qardaş, heeeyyy, qardaş, heeeyyy!!!

Anamı kiridə bilmirəm, Əli!
Hönkürür könlündən bayatı seli.
Olub özü boyda bir alov dili.
Onun göz yaşından yanacaq hər şey,
Qardaş, heeeyyy, qardaş, heeeyyy!!!

**1977.**

## BU GECƏ YUXUDA GÖRMÜŞƏM SƏNİ

Bu gecə yuxuda görmüşəm səni,
Elə bil dünyanı veriblər mənə.
Həyatda həsrətəm sənlə görüşə,
Yuxumda görürəm... şükürlər yenə!

Bu gecə dünyaya sevincim xına,
Ruhun bu arzumu necə bilmişdi?!
Ləpəli saçının hər qıvrımına
Həsrətin bükülüb gizlədilmişdi.

Yuxu arzulara bir pəncərəmi?
Qırdı kədərimə şüşələrini.
Yuxum möcüzəli bir Simurq kimi
Zülmətdən işığa qaytardı səni.

Qıymadın sinəmdə əzab döyünsün,
Oyanıb mənimlə gəldin körüşə.
Qəbrinə yalvarım inaddan dönsün,
Yuxuma göndərsin səni həmişə.

**1977.**

## QƏFİL XƏBƏRLƏR

*«Oğlun Yusif pəncərədən yerə yıxılanda «ata!» deyə qışqırdı...*
*(Qəfil xəbər)*

Bu dəli xəbərə ürəkmi dözər?!
Tutdu gözlərimi zülmətin toru.
Mənim talehimin rənginə bənzər
Bu qəfil xəbərlər ömrümü yorub.

«Öldü!!!»
nidasının soyuqluğundan
Donan ürəyimin getməmiş buzu,
Bir başında ölüm, bir başında qan
Bu nə xəbər idi, zalımın qızı?!

Alışıb kül olar həyat ümidim,
Ömrüm bircə anda sovrular, gedər,
Mənə o dözümü kim verəcək, kim,
Hüseyn Arifin dözümü qədər?!

Qırdın ürəyimi bu xəbərlə sən,
Gözümdən şəlalə tökülər axı!
Zamanın yükünü çiynində çəkən
Şairin dizləri bükülər axı!

...Oğlum!
harayına gecmi gəlmişəm?
Neyləyim, dağılmır tufanım, çənim.
İki ildırımdan zədələnmişəm —
Günahkar deyilmiş taqətim mənim.

Sən məni dünyaya bağlayan sevgi,
Tale bu qisməti pozub, əyməsin.
Qara gözünü aç, danış ki, gül ki,
Atanın ömrünə balta dəyməsin!

Yuxusuz gözümdə lalələr bitib,
Bilsən, dərd daşımaq necə çətindi!
Ürəyim sinəmdən xəbərsiz itib,
Həkim bıçağında yellənir indi.

Tale necə qıyar indidən sənə?!
Ayırmaz dünyanın çiçəkliyindən.
Ay oğul, yıxılma... yıxılanda da
Yıxıl kişiliyin yüksəkliyindən.

**1981.**

## ÜRƏYİMLƏ DİALOQ

–Bilirəm, dərdimi asmışam səndən,
Bilirəm bu yükün ağırlığını.
Neynirdim dözümsüz bir ürəyi mən?
Neynirdim mən sənin fağırlığını?

–Dünyanın dərdi var sənin qanında,
Bunu mən bilirəm, ağrılar bilir.
Ürək var ağrımır doxsanında da,
Belə ürəklərə yazığım gəlir.

–Mənzilə çatmamış məni yorursan,
Nəfəsim təngiyir bircə dolayda.
Elə çırpınırsan, elə vurursan
Döyüntü oluram mən özüm boyda.

–Sən özün saldın ki, bu hala məni,
Dedin ki, qovrulub yaşamaq gərək!
Dərd çəkə bilməzin alıb dərdini
Çəkə bilməlisən Sarı Aşıq tək.

–Sənin ki, cövhərin oddur, qan deyil,
Yanırsan, neyləyim, alovlanıb yan.
Sən ki, ürək kimi damardan deyil,
Asılıb qalmısan ağrılarımdan.

–Ağrını duymasan, duya bilməzsən
Yaşamaq haqqını bu dünyada sən.

**1982**.

## KARDİOQRAM

**Kardioloq Rəsul Həsənova,**

Həyatın qiymətini
Biz olümə borcluyuq.
**B. Vahabzadə.**

Götürüb gəlmişəm yenə dərdimi,
Arazı sıxmışam ürəyimə mən.
Ölüm ayağında titrəyən kimi
Titrəyir sinəmdə döyüntüölçən.

Baxırsan üzümə təəssüf ilə,
Gözündə heyrətdən tonqal qalanıb.
Nə bir təsəlliyə möhtacam elə,
Nə də yaşamağa ümidim qalıb.

Dərdimi açarmı sənə bu xətlər?
Həkim, könlümdəki dünyama sən bax.
Ürəyin sirrini duymur ürəklər,
Guya ki, bir quru cihaz duyacaq?

Çırpıntım titrədir aparatını,
Düşmüsən döyüntü selinə sən də.
Nəbzimlə yoxlasan qol saatını
Zaman axsayacaq əqrəblərində.

Həkim, o xətlərin dönümlərindən
Yetim ümidlərim çətin görünər.
Dəli həsrətimi duysa dərindən
Cihazın od tutub alışa bilər.

Həkim, qoy dərdimi mən özüm çəkim,
Dözümü qalmayıb daha səbrin də.
Yarsan ürəyimi, vallah, ay həkim,
Bıçağın qırılar arzu qəbrində.

Söykənib uçruma ömrün döngəsi,
Həyat çox şirinmiş sonuncu qatda.
Vədəsiz eşqimin həsrət nəğməsi
Həkim, oxunarmı xətlərin altda?

Ağac quruyarsa, yarpaqda deyil,
Səbəbi kökündə axtarmaq gərək.
Susarsa ürəyim, torpaqda deyil
Bir qızın könlündə dəfn ediləcək.

**1982.**

## UNUDULMUŞ ATA

*Bir palatada yatdığımız uzun*
*müddətdə oğlu qoca və xəstə*
*atasının yanına gəlmədi***.**

Köksündə qıvrılıb, inləyir fəryad**,**
Gərəksiz olmusan bir tüstü kimi.
Qanından göyərib boy atan övlad
Sənə öz borcunu belə verdimi?

İndi atılmısan köhnə həsir tək,
Qəlbindən gözünə sığılıbdır qan.
Qapında bağlanmış vəfalı köpək
Min dəfə yaxşıdır belə oğuldan!

Yaman yara kimi göynədir səni,
Dərdini heç kimlə bölə bilmirsən.
Qovurub səbrində əsəblərini,
Ağlaya bilmirsən, gülə bilmirsən.

Daşımaq çətindir bu dərdi-səri,
Övladda insafa, mürvətə bir bax!
Bu gün sənin üçün elədikləri
Onun qarşısına sabah çıxacaq.

Bir kəs də «of!» deməz od tutub yansa,
Onun ürəyi də, beyni də daş ki!
Belə bir oğulun olmağındansa,
Kor qızın olaydı, kor qızın, kaş ki!

Qəlbin — Ədalətin çırpınan sazı,
Şərəfsiz bir övlad anlamaz bunu
Mənliyi tapdanmış belə qansızın
Ocaq da oyatmaz daş duyğusunu.

Beləsi yaşamaz qeyrət içində,
Bilməz namus nədir, bilməz ar nədir.
Bir ata inləyir həsrət içində,
Bir oğul hardasa öz kefindədir.

Sağalıb qayıtsa evə, eşiyə,
Sənə: «Oğul!» —deyib, səsləsin necə?
Ən alçaq məxluqu tanıyaq deyə
Həyat  yaradıbdır səni beləcə.

İnsan doğulsan da, insan deyilsən,
Sən–əcəl ağzında haram bir tikə.
Öl qurtar, onsuz da canlı meyidsən,
Qəbrin adam qəbri sayıldı bəlkə!

**1982.**

## NECƏ DÜŞÜNMƏYİM

*Həkimlər mənə çox fikirləşməyi,*

*oxumağı və yazmağı qadaqan ediblər.*

Əsirmi düşmüşəm həkimlərə mən?–
Ölçüyə salınıb saatım, günüm.
Mən necə ayrılım fikirlərimdən,
Necə düşünməyim, başına dönüm?!

Çəkmərəm, içmərəm, gəzmərəm... nə qəm,
Quraram ömrümü ələmdən, həkim.
Sevdiyim həyatdan ayrı düşərəm,
Əl çəkə bilmərəm qələmdən, həkim.

«Oxuma!» — deyirsən, kitablar küsməz,
«Su içmə!» — deyirsən, dözüb gözlərəm.
Mənim bir anım da duyğusuz ötməz,
Fikirsiz yaşayıb dözə bilmərəm.

Əgər bilirsənsə yaz özgə dərman,
Xəyallar, arzular ölçüyə gəlməz.
Nə qədər döyünür ürək arzudan,
Beyin fikirlərdən əl çəkə bilməz.

**1982.**

## AĞIR DƏRD

*25 il yaşamış şikəst gənc*
*hələ yatağından ayağa dura bilməyib*.

Hövlündən boğulur yenə ürəyim,
Elə dolubdur ki, silə-silədir.
Kövrəlib dönmüşəm göz yaşlarına–
Varlığım göz-gözdür, gilə-gilədir.

Bu qoca dünyada ədalətə bax!
İnsanmı yaradıb, yoxsa oyuncaq?!
Həyata gəlməmiş ölüb o, ancaq
Quru nəfəsi də elə-belədir.

Dili də yoxdur ki, danışsın, dinsin,
Əlləri tərpənmir gözünü silsin.
Bəlkə doğulmazdı... Axı kim bilsin
Onun sümüyü də pilə-pilədir.

Ana qəm doğubdur, ata dərd əkib,
Bu illər ərzində o nələr çəkib?!
Bir nənə Allahı qarğışa büküb,
Deyir: — Elədiyi bilə-bilədir.

İyirmi beş yaşlı dərdə bax, dərdə!
Yalavac iştahı qalıb əllərdə.
Diləksiz bir ömür yaşanan yerdə
Zülüm qucaq-qucaq, şələ-şələdir.

Yaşayır bir ömrün kölgəsin, fonun,
Bilmir dəyərini əvvəlin, sonun.
Arzular da ölüb qəlbində onun —
Könlünün yuvası cələ-cələdir.

Həyat utanırmı yaratdığından?
Bu da bir yaşayış, bu da bir insan!
Əzabla dövr edir damarında qan.
Belə o yaşayanlar hələ-hələdir.

**1982.**

## ANASININ İLQARA AĞISI

*Sevil xanımın dilindən*

Onsuz da həyatın sonu ölümdür,
Səninsə gedişin yaman zülümdür!
Dərdindən qəlbimiz bölüm-bölümdür,
Laylay, vaxtsız solan, baharım, laylay!
Laylay, cavan balam, İlqarım, laylay!

Sənsiz bütün dünya naləyə dönüb,
Yuxusuz gözlərim laləyə dönüb,
Ürəyim üzülüb, nanəyə dönüb,
Laylay, ömrüm-günüm, ilk barım, laylay!
Laylay, nakam balam, İlqarım, Laylay!

Atanı elə bil ildırım vurub,
Ölümün Azadın belini qırıb.
Bu necə batmaqdı, bu necə qürub?
Laylay, mənim fəxrim, vüqarım, laylay!
Laylay, məsum balam, İlqarım, laylay!

Məktəbin ömrün tək yarımçıq qaldı!...
Çiçək arzuların açmamış soldu.
Zaurun, Vəfanın gözü dörd oldu...
Laylay, ilkin payım, nübarım, laylay!
Laylay, əziz balam, İlqarım, laylay!

Əntiqə nənənin dərddir peşəsi,
Ağlar Telli nənən görsə hər kəsi.
Göyə bülənd oldu Solmazın səsi,
Laylay, bəyaz gülüm, ağ qarım, laylay!
Laylay, uşaq balam, İlqarım, laylay!

Sənin heç insafın yoxmuş, a fələk!
Ovunmaz bu dərdim ölən günədək.
İltifat, Rəşid yanır ocaq tək,
Laylay, ağlar gözüm, ah-zarım, laylay!
Laylay, kövrək balam, İlqarım, laylay!

Mənim arzumuydu, ay İlqar, axı,
Sənə bəzəyəydim gəlin otağı!
Nə tez qucaqladın soyuq torpağı?!
Laylay, güllü bağım, gülzarım, laylay!
Laylay, çiçək balam, İlqarım, laylay!

Qəm Gəray əminin köksünü əzir,
Vəli canlı dərddir, kədərdir gəzir.
Tay-tuşun qəbrinə qərənfil düzür.
Laylay, səbrim, laylay, qərarım, laylay!
Laylay, göyçək balam, İlqarım, laylay!

Bu müdhiş yuxunun yoxdur yozanı,
Görüm kor olaydı tale yazanı!!!
Qəza səni tapdı, sənmi qəzanı?!
Ömrümün ilk ovu, şikarım, laylay!
Laylay, qəşəng balam, İlqarım, laylay!

Ağlar günə qoyub bizi qəm indi,
Qəbrində üşüdür səni nəm indi!
Qəlbi qan ağlayan Tofiq əmindi!
Laylay, İlqar boyda məzarım, laylay!
Laylay, bədbəxt balam, İlqarım, laylay!

**1993.**

## *DUYĞULARIN ÇƏLƏNGİ* GÖZLƏRİM

**Vahid Əzizə.**

Günəş kainata gözümdən doğar,
Ay batar gözümdə gecələr mənim.
Dünyada nə qədər ac var, evsiz var
Gözümün içində gecələr mənim.

Mənim gözlərimdə qılınc yarası–
Babəkin qolları gözlərimdədir.
O taydan göylənən durna sırası
Mənim gözlərimə qonsa nə dərdim?

Mənim gözlərimdə həsrət buludu–
Axar ürəyimdən Araz boyda qəm.
Ulu tariximə vurulmuş odu
Sıxıb bəbəyinə saxlayan közəm.

Mənim gözlərimin öz dünyası var,
Onun eşqi uca, kədəri dərin.
Uçsa, gözlərimin içinə uçar
Diz çökmüş körpüsü Xudafərinin.

Mənim gözlərimdə hələ yası var
Qara kağızların, daş heykəllərin.
Mənim gözlərimdə ümid yazı var
Eşqi yetim qalan qız gözəllərin.

Nə sərhəd tanıyar, nə yasaq bilər,
Tikanlı məftillər bəbəklərində.
Təbrizin arzusu ağlayar, gülər
Gözlərimə dolan küləklərində.

Qəlbimdən nə keçsə oxu gözümdən,
Gözlərim könlümün sirli səsidir.
Gözlərim — ömrümün mənim özümdən
Dünyaya açılan pəncərəsidir.

**1971.**

## BAYQUŞ KİŞİLƏR

Qiybət ölçüsüdür bəzi adamlar,
Vaxtı əridirlər müftə, havayı.
Bunların üzündə hər nə desən var
Həyadan savayı, ardan savayı.

Çeynənə-çeynənə sözlər çürüyüb,
Qiybət qazanında yüz ilin pası.
Şəhəri bürüyüb, kəndi bürüyüb
Qiybət uğultusu, qiybət dalğası.

Qiybətlə batır gün, açılır sabah,
Bunlar böhtan əkir, bunlar şər əkir.
Beləsini bığlı görəndə, vallah,
Adam öz bığından xəcalət çəkir.

Bir gündə mininə qara söz yaxır
Ayaqlı yalana yorğan kişilər.
Qiybətdə pələnglə vuruşa çıxır
Evdə arvadından qorxan kişilər.

Sinələr qiybətlə boşalar, dolar.
Bilməzlər şərəf nə, kişilik nədir.
Papaq var, yaylığa dəyişmək olar,
Yaylıq var, on papaq qeyrətindədir.

Hardan baş alıbdır bu qiybət çayı?
Ağızlar — aşsüzən, boğazlar — xəlbir.
Bunlara nə deyək? Adamın, axı,
«Əclaf!» sözünə də heyifi gəlir.

Sarmaşıbdır bizə bu piş-pişilər,
Hörmətdən salıblar kişi adını.
Bir az qurdalasan belə kişilər
Qiybətini qırar öz arvadının.

Adı kişi olan bayquşlara bax!
Allahın bir ucuz ölümü hanı?
Üzdə Vətən deyib, arxada ancaq
Bir anda satarlar Azərbaycanı!

Sözdə bir-birinə heykəl yonarlar,
Bunların hər biri şər yüklü «nər»miş.
Babəki dünyaya verən analar
Qeybət kisəsi də doğa bilərmiş!

**1990.**

## QƏRİBLİK

Dənizlər qasırğa havası çalar,
Sularda doğranar ay cilik-cilik.
Göydən ulduzları əridər, salar,
Günəsi qüruba atar qəriblik.

Səslərəm, səslərəm, qayalar dinər,
Səslərəm, səslərəm, səsim yorular.
Səslərəm, səslərəm, buludlar kişnər,
Səslərəm, səslərəm, səsim qırılar...

**1971.**

## MONTYOR

Ulduz dünyasımı yaratdın yerdə?–
Gecə ulduz-ulduz alışar, yanar.
Gəlin gətirməyə gedənlər kimi
Şəhər də şamlanar, kənd də şamlanar.

Əlinin zəhməti nura çevrilər,
Könlünün sevinci axar evlərə.
İşıqlı küçələr dil açıb sanki
Alqışlar söyləyir sənə min kərə.

Dörd yana uzanıb yüklü naqillər
Yorulmaq bilməyən qolların kimi.
Yolları Günəş tək işıqlandıran
İşıqdan yoğrulmuş gözlərindimi?

Sənin arzuların işıqlarındı,
Gör neçə məkana paylanıb onlar?
Bir yerdə balaca qüsurun olsa,
Gecənin qoynunda sevinc dayanar.

Narahat ürəyin dincəlməz bir an
Güclü yağış yağsa, bərk külək əssə.
Sıxar qucağında bir ağrı səni,
İldırım şığıyıb bir məftil kəssə.

Kim deyir adidir bu peşə, qardaş?
Şərəfli vəzifə daşıyırsan sən.
Narahat həyatın gözəl həyatdır,
İşıqlı bir ömür yaşayırsan sən.

**1972.**

## AĞSAQQAL

Elin hörmətini qazanıbsan sən,
Yaxşılıq olubdur arzun, amalın.
O qədər deyiblər: «Üzün ağ olsun!»
Ağappaq ağarıb saçın, saqqalın.

**1973.**

## XATİRƏLƏR

*Tələbə dostlarım Cavanşir,*
*İdris və Nərimana.*

Haçansa dostluqdan yaranıb cahan,
Ay--gecəyə sirdaş, Günəş--gündüzə.
Gözünün üstündə saxladığından
Kipriklər əbədi bağlanıb közə.

**Məmməd Aslan.**

İllər şaçımızda zədəyə dönər,
İllər —ömrümüzün sarvanı kimi.
Mən zaman görmədim şirin, bəxtəvər,
Ömrün tələbəlik zamanı kimi.

Dünyadan bir köhnə il ötər, gedər,
Ömür ağacından bir yarpaq düşər.
Məni keçmişimə çəkər fikirlər,
Yadıma dördyerlik bir otaq düşər.

Günlər yaşadıq biz sevincli, qəmli,
Bura səmimiyyət yatağı idi.
Bu otaq kitablı, dəftər-qələmli
Adicə tələbə otağı idi.

Bütün müəllimlər, tanış-bilişlər
Dördümüzü doğma qardaş bilərdi.
Birimiz rayona getsəydik əgər
Bizim hərəmizə bir pay gələrdi.

Kiçik damlaların birgəliyindən
Yaranıb cahanda qüdrətli dəniz.
Mənim sözlərimi ilk tərifləyən,
İlk tənqid edən də siz oldunuz, siz.

Yaman tez ayırdı bu illər bizi,
Yaxşı tapışmışdıq bir-birimizlə.
Bəzən dəyişərək köynəyimizi
Görüşə getmişik sevgilimizlə.

Eyni sirr yatardı qəlblərimizdə,
Birgə qəmlənmişik, birkə gülmüşük.
Bir manat qalanda ciblərimizdə
Onu xırdalayıb yarı bölmüşük.

Elə gün olub ki, kasıb qalmışıq,
Tramvay pulumuz çatmayıb belə.
Yığışıb bir təzə pencək almışıq,
Onu geyinmişik biz növbə ilə.

Bir yerdə çəkilib hər vaxt adımız,
Biz bir-birimizə qardaş demişik.
Elə olubdur ki, sınıb qabımız,
Dördümuz bir qabda xörək yemişik.

İdris nağılları yaman xoşlardı,
Qəlbimiz yad idi kədərə, aha.
Axşamdan bir uzun nağıl başlardı,
Bir də görərdi ki, yatmışıq daha.

Danışardı yavaş, gülərdi yavaş,
Bizi güldürərdi özü çox zaman.
Onun bayram günü bişirdiyi aş
Əsrlər ötsə də çıxmaz yadımdan.

Cavanşir dinəndə gülərdi gözlər,
Yersiz söz çıxmazdı dodaqlarından.
Onun söylədiyi ağılı sözlər
Sırğa tək asılıb qulaqlarımdan.

Şaqraq gülüşünü sanki Nəriman
Dilindən almışdı gur şəlalənin.
Bir dəfə sən ona söyləsəydin: «can!»,
Yolunda canından keçərdi sənin.

Geriyə dönərmi bir də o zaman?
İllərdən xatirə qalıbdır indi.
Biz hələ subayıq, amma Nəriman
Bir oğul atası olubdur indi.

...İllər saçımızda zədəyə dönər,
İllər — ömrümüzün sarvanı kimi.
Mən zaman görmədim şirin, bəxtəvər,
Ömrün tələbəlik zamanı kimi.

**1973.**

## QAĞAYI VƏ DƏNİZ

Dənizlə, kükrəyər, dənizlə çağlar,
Dənizlə sevinər, gülər qağayı.
Nəğməli ömrünü dənizə bağlar,
Elə dənizdə də ölər qağayı.

...Sularda bu hiddət, bu qəzəb nədir?
Dənizdə qağayı batıbdır deyən.
Dalğalar qağayı nəğmələridir–
Düşüb ləpə-ləpə dimdiklərindən.

**1974.**

## NEFT DAŞLARI

Bir gözəl atılıb öz qalasından–
Sularda ulduzu sönüb Bakının.
Qolları Xəzərdə uzalı qalıb,
Əlləri dalğıca dönüb Bakının.

**1974.**

## BAKIDA TƏZƏ İL

Diksindi fişənkdən mürgülü göylər,
Başladı səmanın toyu, düyünü.
Geniş yatağına sığmayan Xəzər
Bakıya can atar yeni il günü.

İl ömrü bölünüb saniyəyədək,
Saatda zamanın nəbzi döyünər.
Atar köhnə ili köhnə paltar tək,
Əqrəblər yenidən bir il geyinər.

Qocalar sanayıb ötən illəri
Bir az kədərlənib kövrəkləşərlər.
Qoyub «sultanlığı» bir addım geri,
Subaylar bir yeni izə düşərlər.

Xoşbəxtlik, səadət öz çalarıyla
Gül səpər gənclərin yanaqlarına.
Göylər ulduzuyla, göylər qarıyla
Enər göy yolkanın budaqlarına.

Şaxta baba ilə birgə dolanar
Yolkanın başına uşaqlar hamı.
Baba istəyinə həsrət qalanlar
Babalı olarlar bayram axşamı.

İşıqlar bənzəyər gecə gülünə,
Küçələr geyinər bəzəkli libas.
Vurulub Bakının təzə ilinə
Xəzrinin hiddəti soyuyar bir az.

**1974**.

## ƏSGƏRİN İLK MƏKTUBU

Bir qız yuxusuna şirinlik qatar,
Ana həsrətini ovudar bir az,
Muştuluq qonşunun oğluna çatar,
Nənə bu kağızı öpməkdən doymaz.

Sətirlər dil açar, kəlmələr dinər,
«Vağzalı» çalınar qız ürəyində.
Əsgər məktubları əsgərə dönər,
Qadası alınar qız ürəyində.

Əsgər məktubları — çiçək dəstəsi,
Əsgər məktubları — sevdalı ürək.
Oxumaq istəsən «Vətən nəğməsi»,
Əsgər şinelini deyəsən gərək.

**1975.**

## DOLAYLAR

Dünyada dolaylar nələr, nə qədər!...
Ömür dolayları, yol dolayları.
Biri zirvələrə burulub gedər,
Biri ömrümüzdən qüruba sarı.

Dolay var, həmişə işıqlı, nurlu,
Dolay var, zülmətdə əriyib, itir.
Dolay var, döngəsi vüsal uğurlu,
Dolay var, üstündə bədbəxtlik bitir.

Ömrün bir dolayı evcik həvəsli,
Birinin çiynində qayğılar yükü.
Ömrün bir dolayı «Vağzalı» səsli!
Birində yetimlik — boğucu bürkü.

İsinir güneydə, donur quzeydə,
Peşimanlar kimi dönür, qayıdır.
Yağışdan sonrakı qövsü-quzeh də
Göyləri yeddirəng bir dolayıdır.

Dolaylar dağlara kəmənddir, nədir?
Sellər bu yerlərdə dərin arx açır.
Dolayların biri külək dillidir,
O biri dolaysa — duman arxacı.

Burda cavanlığım bir köhlən minib,
Nalından qopan od daşı yandırıb.
Cığır var, zirvəni dikinə enib,
Cığır var, qocalar dolaylandırıb.

Keçilməz olubdur bir dolay təkdir
Füzuli şerinin halaylarında.
Çoxunun dizləri titrəyəcəkdir
Sənət dünyasının dolaylarında.

Analar həsrətlə yol gözləyiblər,
Kədər hönkürübdü laylalarında.
Ərən igidləri dəfn eləyiblər
41-lə 45-in dolaylarında.

Dünyada dolaylar nələr, nə qədər!...
Ömür dolayları, yol dolayları.
Biri zirvələrə burulub gedər,
Biri ömrümüzdən qüruba sarı.

**1977.**

## QOCA DƏNİZÇİ

Gələr görüşünə qoşun ləpələr,
Duyar göy dənizin xoş qılığını.
Şəhərdə ömrünü tükənmiş bilər,
Sahildə unudar qocalığını.

Motros köynəyində ləpə mürgülər–
Dənizdən bir parça əyninə geyib.
Alnında ləpədən qırçın hörgülər,
Dilində dənizin nəğməsi keyib.

Mavi gözlərində bir dəniz yatar,
Dalğalar ən uzaq ümiddir ona.
Çılğın gəncliyini özünə qaytar,
Sonra Şah dağını üyütdür ona.

Baxışı tökülüb dənizə yenə,
Zamandan gileyi dizində dinir.
Mavi gözlərinin zəifliyinə
Kipriklər kölgə tək titrəyib enir.

Dənizə ürəkdən elə vurulub
Xeyli gecikibdi evlənməyi də.
Dilində bir qayğı, bir vərdiş olub
Qarıya «Dənizim!» söyləməyi də.

Əriyər qəlyanın acı tüstüsü
Ömrünün mənasız günləri kimi.
Qəlbində zamandan umu-küsüsü,
Üzündə payızıı xəzan bükümü.

Burda kəlmə kəsməz heç bir adamla,
Tor atar günlərin durğunluğuna.
Sahildən ayrılıb asta addımla
Qayıdar ömrünün yorğunluğuna.

## 30 YAŞIM

Bir ömrü illərlə ölçmək düz deyil
Ömürlə illəri ölçəsən gərək.
**B. Vahabzadə**.

Yandım şaxtasında, dondum buzunda,
Ötən günlərimi haradan tapım?
Sönmüş ocağımın soyuq badında
Küt getmiş illəri mən necə yapım?

30 yaş ömrümlə gəldi, tapışdı,
Aylara yüklənmiş illər mürgülü.
İl oldu ağrımdan elə yapışdı
Həkim aciz qaldı «əlisüngülü».

İllər də yaşadım — şimşək ömürlü–
Göz yumub—açdım ki, yerində yoxdur.
İllər də yaşadım, bozarmış külü
Verdiyi istidən, közündən çoxdur.

Perik xatirələr düşmür yönünə,
Köklənib dərdimin sarı simi də.
İlişdim vicdanın məhkəməsinə,
Hakimi də mənəm, müttəhimi də.

–Nə saldın illərin caynaqlarından?
–Yaşa necə deyim yavaş get, ləngi?
–Çəksə tərəzidə ömrünü zaman?...
–Nəf gözə lazımdır qaya pərsəngi.

İtirdiyim illər — kül olan ocaq,
İndi alışmışam korun tüstümə.
Vicdan qarşısında müttəhim olmaq
Dünyada ən ağır cəzaymış demə!

Özüm ki, özümə kəsildim qənim,
Atdım vaxt selinə ömrü havayı.
Elə dəyirmanda üyünüb dənim,
Unluqda hər şey var, undan savayı.

Gərək əməlinlə heykəl yonasan
Elin yaddaşında yurd salım deyə.
Yansan, ürəyindən elə yanasan
Dünya alovuna heyrət eləyə.

Getdi 30 ilin polad dözümü!...
İmkanım yanında xəcalətliyəm.
Gümanım yoxdur ki, mən öz sözümü
Bu 30 dərəli zirvədən deyəm.

Burdan keçmişimə səsimmi çatar?
Əriyər harayım dərin dərədə.
Mənim ürəyimdə birümman yatar,
Çətin tufan qopa, çalxana bir də.

Mənasız illəri apardı külək,
Yolunu nə arzum, nə sevdam kəsdi.
Mənim 30 yaşım nağıl dili tək
Yaman yüyrək oldu, yaman tələsdi.

İllərin nəbzini tutmadım... nəsə,
Bir də ki, illərdə nə günah, axı?
Söyüd ağacları bar gətirmirsə
Biz niyə günahkar sayaq torpağı?

...Dünyadan köç etmiş 30 yaşıma
Əlləri uzalı həsrətim qalar.
Ömrümdən nə qalıb çıxar qarşıma,
Məndən o illərin heyfini alar.

**1979.**

## UŞAQLIQ XATİRƏLƏRİ

Od parçası idim başdan-ayağa,
Sapanddan teylənən çalpanağıydım.
Səsim səs salardı dərəyə, dağa,
Qayalar başına çalpapağıydım.

Qorxunc cığırları yalmanlamışdım,
Haçabel təpələr kəhərimiydi.
Müdhiş keçidlərdən qolaylanmışdım,
Palıd addamaclar yəhərimiydi.

Həyat yaranmışdı sevincdən onda,
Duymazdım kədəri, bilməzdim dərdi.
Mənim o çağlarım öz xəyalında
Dünyaya arzudan çələng hörərdi.

Elə bilirdim ki, yağsa bəyaz qar
Yaraşığı yağır təpənin, yalın.
Mən elə bilirdim yaşamaq olar
Elə başıaçıq, ayağıyalın.

Mən elə bilirdim hər vaxt, həmişə
Günəşin nurundan pay alasıyam.
Deyirdim: kəhkəşan bəxtimə düşsə,
Onu insanlara paylayasıyam.

Həyat yaranmışdı sevincdən onda,
Duymazdım kədəri, bilməzdim dərdi.
Mənim o çağlarım öz xəyalında
Dünyanı özünə beşik bilərdi.

**1981.**

## İKİNCİ SƏS

***Bəxtiyar Vahabzadəyə***

Dünyanı asanda əsəblərindən,
Ürəyin alışdı «Muğam» üstündə.
İkinci səsini yaşadırsan sən
Gerçəyin daxili püskürtüsündə.

Yalanı doğruya biz büksək əgər
Etiraz hönkürüb necə dinməsin?
Dünyada yaranan ən şah əsərlər
Əks-sədasıdır ikinci səsin.

Küləklər mələsə yorğun qanında
Soyuq qış qapını döyməsinmi bəs?
Heyrət şaxtasında idrak donanda
Adamı özünə qaytarar bu səs.

Boğdun harayını ikinci səsin
Balqabaq bir başa qiymət verəndə.
Vicdan necə dözsün, silkələnməsin
Əyrini haqsız yox, haqlı görəndə?

Bəlkələr şübhənin məskəni, yurdu,
İnamsa tunclaşıb ikinci səsdə.
Elə ki vicdana qıfıl vuruldu
Arzu yetim qalar, ürəklər xəstə.

Ümidlər, diləklər tanımaz sərhəd
Xəyalın hüdudsuz kainatında.
Ömrümüz-günümüz dalğalı bir xətt
Olanla-olmazın koordinatında.

Neçə tilsim yatar, möcüzə yatar
Fitrətin açılmaz düyünlərində?!
Biri buza dönsə, biri od çatar –
İki səs qolboyun ömr edər səndə.

Gəlimli-gedimli dümyamız ki, var
Sevilər qayğıyla, duyular hisslə.
İnsan öz-özünü görər, tanıyar,
Həm də kamilləşər ikinci səslə.

Ayaq səsləriylə tanınsa sevgi,
Bəxt yar olmayanda bilmək çətindir.
İkinci səsdəki ağrını sev ki,
Tale ağladanda gülmək çətindir.

Baxarıq hüdudsuz göylərə sarı,
Ölçülər, sərhədlər gözdən silinsin.
Yaşadar dünyada atılmışları
Həyata çağrışı ikinci səsin.

Təpədən-dırnağa təzaddır dünya
Ömrümüz qaraya, ağa bölünür.
Bizi həqiqətdən ayırıb xülya
Gələcək dünyaya apara bilir.

Varlığın yarısı utanardımı
Ömürlə illəri ölçsəydi kimsə?
Qanunlar, qaydalar yaranardımı
Bəşər tapınsaydı ikinci səsə?

**1982.**

## TƏRƏDDÜD

Ərimə bəlkələr qeylü-qalında,
İnadlı ürəyim vüsal acıdı.
Enişli-yoxuşlu ömür yolunda
Tərəddüd naməlum yol ayrıcıdı.

Arası qədərdir «yox» ilə «hə»yin,
Tərəddüd şübhənin yanan gözüdür.
Donan tərəddüddür sərhəd dirəyi–
Bilmir ki, vətəni hansı üzüdür.

Nə inkar eləyər, nə təsdiqləyər,
Təzadlar içində əsər yarpaq tək.
Nə buluda dönüb yağış çiləyər,
Nə də açılar ki, gün üzü görək.

Sevgimi, nifrətmi onda yurd salıb?
Sual dərəsində boğulub hayı.
Arazın suyu tək əlacsız qalıb,
Gah o tayı öpər, kah da bu tayı.

Qanda dövr eləyər, heyrət doğurmaz,
Ziddiyyət içində açılmaz donu.
Nə çovğunlu qışdı, nə çiçəkli yaz,
Sərsəri eləyib bəlkələr onu.

**1982.**

## ÖZÜM BOYDA VƏTƏNƏM MƏN

Bir insanın talehiçün
Gözümdən od tökənəm mən.
Bu dünyanın əzabını
Kürəyimdə çəkənəm mən.

Yeri, göyü zaman-zaman
Paralayıb acgöz insan.
Sərhədləri bu dünyadan
Dırnağımla sökənəm mən

Bu torpağın qışı da yaz,
Sinəm üstü qasırğa — saz
Var-yoxunu qızırqanmaz
Qeyrətinə söykənəm mən.

Vətən dönüb nur dağına,
Qurban ollam bir gün ona —
Qarışaram torpağına —
Özüm boyda Vətənəm mən.

**1982.**

## DƏRDLƏRİMİZ

*20 yanvar faciəsini törədənlərə*

Çox əzab daşıyıb bu yurd, bu diyar,
Başdan zurna çalıb hərə bir cürə.
Xalqın talehini tapşırıbdılar
Xalqın dərisini soyan kəslərə.

Pul meydan sulayıb, cövlan eləyir,
Günahsız qanları pulla yuyurlar.
Hər kim nə istəsə yazır, söyləyir,
Buna da aşkarlıq adı qoyurlar.

Vəzifə başında yenə oğrular,
Yenə də iş görür hiylə, fırıldaq.
Nə qədər ortada "haq var, hesab var",
Həmin dəyirmandı, həminsə çax-çax.

Buxova salınıb ədalət, düzlük,
Qeyrətli ürəklər dözüb qalmadı.
Müdirlik taxtında əyləşən «3»-lük
«10»-luğu, «100»-lüyü vecə almadı.

Buyruq qulu olan «möhürlü nərlər»
Qeyrəti, namusu ağır yük bilir.
Qəfəsə salınır pələnglər, şirlər,
Tülküyə, çaqqala meydan verilir.

Xalq suya möhtacdır, havaya möhtac,
Yalanlar doğrunu boğazdan asır.
Boğur kasıbları, boğur ehtiyac,
Arxalı köpəklər yenə qurd basır.

Köhnə öz kefində, yeni  heç zaddır,
Yoxsulluq içində çırpınır bəşər.
Çəmən həmin çəmən, at həmin atdır,
Yalnız hörüyünü dəyişibdilər.

Analar ümidi bükür sözünə
Qundaqda körpələr kiriyə bəlkə.
Ət, süd əvəzinə, yağ əvəzinə
Yalan faizləri yeyir bir ölkə.

Tükənib hər şeyin barı, bəhrəsi,
Bərəkəti qaçıb zəminin, çölün.
Alınıb dilindən haq deyən səsi,
Beli yağır olub ağır bir elin.

Bu necə ölkədir, bu necə qanun?
Zülümdən, əzabdan niyə doymurlar?
Allaha şükür ki, hələ kasıbın
Aldığı nəfəsə vergi qoymurlar!

Namərdlər baş olur başsız ölkəyə,
Hərrac bazarında Vətən torpağı.
Sonra da deyirlər: “Bu millət niyə
Dilənçi kökündə yaşayır, axı?”.

Ağlayır Vətənin torpağı, daşı,
Gözümüz kor olub, görmürük, nədir?
Bizim başbilənlər sağlıqda yaxşı,
Öləndən sonrasa «xalq düşmənidir».

Sapı özümüzdən baltalar iti,
Meşədə meşəlik qalmayıb daha.
İtirib namusu, yeyib qeyrəti
Ümid bağlamışıq qadir Allaha.

Qoşulub dartırıq nə yükləsələr,
Dillər qıfıllıdır, ayaq buxovlu.
Bürünüb yanvara bir dəhşət gələr,
Gələr bir millətin faciə yolu.

Şəhidlər «Azadlıq» himnini çalar,
Oyansın qeyrətlər vuruş səsinə.
Mənim ürəyimi kəsib açsalar,
Bənzər Azərbaycan xəritəsinə.

**1990.**

## ZƏLİLLƏR
## BİR TİPƏ MƏKTUB

Vəzifə stolun düşübmüş göydən–
Cazibə gücüsən bu Ərzin güya.
Səni öz üstündə gəzdirdiyindən
Nə vaxtsa xəcalət çəkəcək dünya.

Birinin əlinə tökülən susan,
Birinin başına «Qaragül» papaq.
Xəbislik mehinə "Maral otu"san,
Sənin tək yaşayır zəlilər ancaq.

Bərq vuran «Volqa»ya mindiyin anda
Elə bil Qıratı minirsən,
Yavaş.
Kiməsə vəzifə tapşırılanda
Vicdanın xıltı da görünəydi kaş!

Fəhlə salamına məhəl qoymazsan,
Beçə boynu kimi dikələr burnun.
Dünyanı yesən də yenə doymazsan,
Ümmanmı, dəryamı sənin o qarnın?!

Bu gülzar Vətəndə niyə bitibsən?
Artırdın canlının say çoxluğunu.
Heç kim bilmədi ki, sən necə tipsən,
Özün bilirsənmi kim olduğunu?

**1983.**

## QARDAŞ

*(Bir məktuba cavab)*

Tülkü kresloda elə qışqırır,
Aslan yol axtarır deşiyə, qardaş.
Gör zaman nə günə salıb dünyanı,
Köhlənlər baş əyir eşşəyə, qardaş.

Nə kişilik qalıb, nə hörmət, xətir,
Bilinmir haram nə, ya halal nədir.
İndiki ürəklər daşdır, dəmirdir,
Keçmişdə bənzərmiş şüşəyə, qardaş.

Tale xəlbirini tərsə ələyir,
Keçi müdir olub, qurdlar mələyir.
Fərələr ortada cövlan eləyir,
Xoruz çıxa bilmir eşiyə, qardaş.

«Kişi» var, evində arvaddan küsər,
«Kişi» var, başını pambıqla kəsər.
Namusdan, qeyrətdən qalmayıb əsər,
Yaltaqlıq dönübdür peşəyə, qardaş.

Urvatı qalmayıb xeyirlə şərin,
Ovsarı ulağa bağlanıb nərin.
Pul tanrısı olub indi bəşərin.
Çevrilib həyata, nəşəyə, qardaş.

Hörmətdən düşübdür kişilik sözü,
Xəcalətdə qalıb papağın özü.
Əyri elə kəsir doğrunu, düzü,
Yıxılır yorğana, döşəyə, qardaş.

Mən də bu Allahın işinə matam,
Dərd-sərim qoymur ki, gecələr yatam.
Satqın elə artıb, qorxur ki, adam
Əl atıb yanını qaşıya, qardaş.

Tofiqəm, sözümdə bir yalan yoxdur,
Zamanın sinəmdə yarası çoxdur.
Dünya həmin dünya, ox həmin oxdur–
Kim yeyə, kim isə gövşəyə, qardaş.

**1988.**

## ÇƏTİN ADAM

Sənin ki, mənliyin qıfılbənd imiş–
Üzdə özgə cürsən, daxildə başqa.
Dilinin ilgəyi bir kəmənd imiş,
Yerin ayaqdadır, özünsə başda.

Bəxtinə bir naxış salıbdır dünya,
Hissinə, duyğuna kök atıb qaya.
Kiminsə dərdini çəkirsən guya–
Bir barmaq çənədə, birisi qaşda.

Sözdə şahidisən safın, düzlüyün,
Astardan betərmiş sənin üzlüyün.
Tutmusan nəbzini ikiüzlüyün.
Ürəyin əksini tapıbdır daşda.

Hiyləni qılıqla elə hörmüsən,
Deyərlər: bir imam övladısan sən.
Ömrün mənasını duyub görmüsən
Axşamı kababda, səhəri xaşda.

Qoşman xəsislikdir, ləqəbin qırçı,
Baxışın müəmma, sifətin qırçın.
Atgetməz yollarda büdrəmir qıçın,
Özün nə yaşdasan, hiylən nə yaşda!

Həyat çox qısadır, zaman səbirsiz,
Gəlmisən, gedərsən səssiz-səmirsiz.
Bir ömür yaşarsan sən ki, ömürsüz,
Yerin də, yurdun da qalacaq  boşda

**1981.**

## OLDU

Bu da bir nov adamdır.
Müdir keçdi bir anbara
Fikri zülmət, qəlbi qara.
El malını sora-sora

Qarnı şişib tuluq oldu.
Bel bağlayıb yüzlüklərə,
Qızdı gözü, döndü nərə.
Dava saldı məclislərə,
Şuluq oğlu şuluq oldu.

Neçəsinə diş qıcartdı,
Neçəsinə təpik atdı.
Bu nə cürə məxluqatdı?!
Tülküyə muştuluq oldu.

Maşın onun, ad kimindi?
Təndir onun, bad kimindi?
Deyəndə: arvad kimindi?
Üzü suluq-suluq oldu.

Qurulanda haq divanı,
Yarpaq kimi əsdi canı.
Suya düşdü çöl siçanı,
Yamanca cumculuq oldu.

Arvad-uşaq qaldı... getdi,
Başa qapaz saldı, getdi.
On iki il aldı, getdi,
Getməyi biryolluq oldu.

**1981.**

## BU ZALIM OĞLU

Meymunlar tər töküb insana döndü,
Adam olmadı da bu zalım oğlu!
Başı dizindən də aşağı endi,
Vecə almadı da bu zalım oğlu!

Zurna ver ƏLİNƏ püləyib çalsın.
Bir gündə yüzünün «ağrını alsın».
Dəridən-qabıqdan çıxdı ki, qalsın,
Yadda qalmadı da bu zalım oğlu!

Elə arsızdır ki, 50 yaşında
Bir dənə ağ tükü yoxdur başında.
Vətən torpağında, Vətən daşında
Bir iz salmadı da bu zalım oğlu!

Sırtıldı sifəti, döndü sırtığa,
Təlxək tək oynadı çəpik-çırtığa.
Neçə il yaşadı, bircə yırtığa
Yamaq olmadı da bu zalım oğlu!

Qəlbi niyyəti tək şərdir, qaradır,
Təpədən-dırnağa yaman yaradır.
Gözü yas axtardı, kədər aradı–
Qara çalmadır da bu zalım oğlu!

**1993.**

## P O E M A
## BİR TALEYİN GÖYNƏMLƏRİ
### Heyrət

–Olarmı?
–Buyurun, buyurun, gəlin...
Bu kimdir?! Gözlərim alacalandı.
Çıxıb qucağından xatirələrin
Qarşımda qaragöz Aynur dayandı.

Dərdin çovğunuyla ötən səkkiz il
Onun həyatından keçməyibdimi?
Zamanı saxlayıb Aynur elə bil,
Saxlayıb saatı saxlayan kimi.

Gözlər həmin gözdür, baxışlar həmin,
Elə əvvəlkidir həlim səsi də.
Mənim yetim qalan məhəbbətimin
Oyandı özü də, xatirəsi də.

–Bura təyinatla göndərilmişəm...
Diksindim bu səsin titrəyişindən.
Hissim də, duyğum da donmuşdu bu dəm,
Dərk edə bilmirdim həqiqəti mən.

İlləri adlayıb necə gəlmişdi?
Taqətim yoxuydu danışım, dinim.
Bir az da gəncləşib gözəlləşmişdi
Səkiz il əvvəlki Aynurum mənim.

Bir parça gecəni hörük yerinə
Hörüb sallamışdı çiyinlərindən.
Dəniz gözlərinin giləlİrinə
Sanki od hopmuşdu od kürəsindən.

Xəyalım baharda, özüm payızda,
Təzadlar qoynunda ürək nə etsin?
Döyükə-döyükə qalmışdı qız da–
Bilmirdi gözləsin, bilmirdi getsin.

Həyatda insanın xəyalı yalnız
Tanımaz ölçünün nə olduğunu
Əlində uzalı qalmışdı kağız,
Heyrətə salmışdı heyrətim onu.

–Rəis sizsiniz?..
–Hə... mənəm... mənəm
O elə bildi ki, yolu çaş salıb.
Hardan biləydi ki, elə çeşməyəm
Suyum quruyubdu, çuxurum qalıb

Xəyalın əlində mən bir oyuncaq,
Daş kimi keymişdi bütün bədənim.
Alıb kağızına qol çəkdim, ancaq
İmzam oxşamadı imzama mənim.

Fikirlər keçmişə uçurdu məni,
Döndüm o illərin sahillərinə.
Xəyalım güzgü tək olub-keçəni
Gözümün önündə əks etdi yenə.

## İMTAHAN

Məni yola saldı qayğılı kəndim,
Arxamca su atdı ana ümidi.
Ötən bu on ildə öyrəndiklərim
İnamdan yoğrulmuş köməyim idi.

Bir kənd sevinmişdi gümüş medaldan,
Könlümdə arzular çiçək-çiçəkdi.
Gözləri yollara dikilib qalan
O kənd sorağımı gözləyəcəkdi.

Kəndçi təsəvvürüm elə kənd boyda,
Sadə körkəmimdən kənd boylanırdı.
O yerin bulağı, cığırı sayda
Gözümdə arzular yuvalanırdı.

Suyu havası tək təmiz, müqəddəs,
Torpağı yoğrulub dünya varından.
Məni bu şəhərə gətirən həvəs
Boy atıb o kəndin arzularından.

...Bu gün imtahandır. Həyəcan, qorxu...
Ürəyim çırpınır təlaş içində,
Atalı-analı gəlibdir çoxu,
Yarı bu tindədir, yarı o tində.

–«Dayın» var?
–Bəli, var.
–Kimdir, nəçidir?
Böyük bir kolxozun aqronomudu.
Qəhqəhə səsindən hər yan titrədi,
–Ələ, kəndçi oğlu, kəndçiymiş ki, bu!
–Mən «dayı» deyirəm, pulla behlənən,
Əgər yoxundursa, qayıt, get, bala.
–Doğrusu, heç bir şey anlamıram mən.
Nə vaxtdan məktəbi satırlar pula?

Tənəli gülüşlər zəhərdən betər.
Dolmuş gözlərimə qara tor endi.
Nə vaxt gözdən düşdü qızılı kəndlər,
Nə vaxtdan kəndçilik qaxınca döndü?!

...Haqsızlıq minmişdi atına o gün,
Belə imtahanı heç gözləmirdim.
Bayaq kəndçilərə lağ eləyənin
İki misalını həll edib verdim.

...Keçdi on beş günlük qorxu, həyəcan,
Tapmışdı neçəsi «dayı», «havadar».
Mən ki, inanmırdım axı bir zaman
Deyəndə: «Arxalı köpək qurd basar».

Səbrim ürəyimi silkələsə də
Dözüb gözləyirdim son günləri mən.
Aldığım qiymətlər bəs eləsə də
Adlaya bilmədim müsabiqədən.

## KƏNDƏ MƏKTUB

Yanına nə üzlə qayıdım, gəlim?!
Sənin inamını heç elədim mən.
Hansı xatirəni ayıldım, gəlim?
Bir süslü arzunu puç elədim mən.

Sənin ki, saflıqda tayın yoxuymuş!
Bu düyna malından gözün toxuymuş.
A kəndim, pislər də yaman çoxuymuş,
İndi aradım mən, seçələdim mən.

Dilindən düşməyən ümidin idim,
Qaya kəhərliydim — igidin idim.
Bir ocaq işığı itiyim idi.
Düşdüm çən-dumana, gecələdim mən.

Bir heyrət tonqalı yandı yadımda,
Yaman pörşələndim bu gur odumda.
Haqsızlıq buxovu qol-qanadımda
Qəhərdən cücərib qönçələdim mən.

Mənzilə yetməmiş, fikirlərimi
Kəsdilər  gur çayı kəsənlər kimi.
Bu pak ürəyimi — güvənc yerimi
Qəmin caynağıyla milçələdim mən.

Bəzən mübahisə küləyi əsdi:
–«5» verək?
–«4» verək?
–Əşi, «4» bəsdi.
Beləcə hərəsi bir qiymət kəsdi.
Əsəbdən boğulub, çeçələdim mən.

...Yaman üstələyib əyrilər düzü,
Gəl haqqı danmayaq, söyləyək, kəndim
Qanundan dərs deyən alimin özü
Qanunu əyirsə, nə deyək, kəndim?

Qıfıllar altına salınıb vicdan,
Var-dövlət nə yaman şirinləşibdir.
Lüğətdən haq sözü itib nə vaxtdan?
Tamah dərə kimi dərinləşibdir.

A kəndim, oğlunun sözünü sənin
Hardasa tərsinə yozdular bəlkə.
Bu gün əyri yolla qiymət verənin
Sabah «2»sini yazdılar bəlkə.

Şöhrət havasıyla indi dinənlər
Bir gün özlərini tapdayacaqlar.
Bu gün «at oynadıb», «köhlən minənlər»
Sabah kor yabı da tapmayacaqlar.

Ürəyim siləydi, elə dolmuşdu
Kövrək bir nəğməyə köklənmiş sazdım.
Başıma nə gəlib, nə cür olmuşdu
O cür də rektora ərizə yazdım.

## SEVİNC

Yandı ümidimin sönmüş çıraqı,
Buz qatı əridi ürək dunyamın.
Sevincdən yoğrulmuş bu şad xəbəri
Bügün ağrısına xəstə anamın.

Qəbul olunmuşam ali məktəbə!
Ay ana, oğluna bəxti yarıymış!
İndi tələbəyəm, ana, tələbə,
«Yaxşı ki, dünyada yaxşılar varmış!»

Xeyirxah bir ələ düşüb ərizəm,
Yoxlayıb, haqqıma haq qazandırıb.
Mən sevinc dalğalı elə dənizəm
Sahilim arzumdan mayak yandırıb.

Bəzən nəzərimiz aldatdı bizi —
Yaxşını tanıdıq çox vaxt pis kimi.
Üzümdə-gzümdə beş ilin izi
Yanına gələrəm mühəndis kimi.

## TƏLƏBƏLİK

Çalxanan sevdalar sığmaz ürəyə,
İstəkdən yoğrular hər anı ömrün.
Dünyanı arzuya bələyək deyə
Gələr tələbəlik zamanı ömrün.

Hər gələn sabahın gözündə istək,
Ən sadə arzu da müqəddəs olar.
Ömrün o çağından xatirələr tək
Ən ülvü, ən əziz bir miras qalar.

Elə tez yetişər beş ilin sonu,
Qurtarar şıdırğı yaz yağışı tək.
O illər — dünyanın eşq etalonu,
O illər — qayğısız illərə örnək.

Bilməzsən ehtiyac nə olduğun,
«Şah kimi» yaşarsan təqaüdünlə.
Dadmazsan dünyanın yoxsulluğunu
Cibində bir manat olmasa belə.

Elə vurularsan, çirkin də olsa
Sevgilin Leyliyə dönər gözündə.
Axşam görüşünə lap az da qalsa
Saatdan gileyin yanar sözündə.

İmtahan qorxusu səni silkələr,
İntizar boy atar ümidlərində
Müəllim insafı hayına gələr
Çaşsan sualların dərin yerində.

Fəsillər beləcə axar, ötüşər,
Yaşarsan beş ili arzu naxışlı.
Kiminin bəxtinə bir «ceyran» düşər
Kiminin ilk eşqi gözləri yaşlı...

Bəzən yaxşılığa heyrət etdim mən,
Bəzən ayağıma pislik ilişdi.
Arzular qoynunda ötən beş ildən
Bəxitimə Aynur tək bir gözəl düşdü.

## QARA BOYA

Talehin gözləri kor olsun görüm!
Dağıldı özülü uca qalamın.
Necə cavab verim, necə hay verim
«Ana!» fəryadına mən üç balamı?!

Köçdü nazlı sonam... köçdü əbədi,
Sağalmaz dərd idi... Sağalmadı da.
Həyata gözümü açandan bəri
Sinəmdə salamat yer qalmadı ta!

Qara tüstü çıxdı təpəmdən mənim,
Bu dünya dərd üstdən dərd qalayandır
Elə od asılıb könlümdən mənim
Bir çınqı közüylə bir salı yandır.

Həyatın bir üzü qara boyalı,
Silədir qəm ilə, məşəqqət ilə.
Qara yuxularda insan xəyalı
Yüzillik ölünü dirildir belə.

Qara xatirələr yandırdı məni.
Qara ocaqlarda bişdi ürəyim.
Hələ dağılmamış yetimlik çəni,
Qardaş həsrətinə düşdü ürəyim.

Həyatın ən qara yükü çiynimdə,
Çəkərəm, çəkərəm... dizlərim yorğun.
Mənim ümidlərim qara biçimdə,
Mənim arzularım nə qədər solğun!

Möcüzə gözləyir qızım hələ də,
Gözləyir, gözləyir... bir xəbər olmur
Mən ona «can!» desəm milyon kərə də
Bir ana «çor»una bərabər olmur.

Sorğular, suallar selə dönəndə
Qara duman alır könül varımı.
Hər dəfə yuxuda ana görəndə
Ovuda bilmirəm oğlanlarımı.

Dərdimi kim anlar, söyləyim kimə?
Göynədir onları bir ana yası.
Mənim üç körpəmə — üç həsrətimə
Su kimi gərəkdir ana laylası.

Nə qədər təsəlli verim yalandan?
Düşmüşəm qapqara kədər selinə.
Qara boyalara həmdəm olandan
Həsəd aparıram «Gecə gülü»nə.

İşə yollanıram... üç cüt dolmuş göz
Yalvarır arxamca: «Tez qayıt, ata!»
Elə qovrulur ki, ürəyim köz-köz
Dönür özü boyda səssiz fəryada.

Kuklasını qoyub öz beşiyinə
Qızım layla ilə yatıran zaman.
Yanıb-yaxılıram mən dönə-dönə,
Az qalır od tutsun damarımda qan.

Mehrini kuklanın üstünə salıb,
Qızım — ana acı, ana təşnəsi.
Uşaq yaddaşına ilişib qalıb
İllərdən o tayda bir ana səsi.

Bu bir neçə ildə nə zillət çəkdim?
Kimsəsiz qaldılar çox zaman evdə.
Bəlkə bu sevdaya düşməyəcəkdim
Olsaydı onlara bir həyan evdə.

## SEVDA

Axdıqca ulduz tək illər ömürdən
Bir dəli sevdanın cənginə düşdüm
Aynura bənzəyən Vüsaləyə mən
Çaşıb neçə dəfə Aynur demişdim.

Bəlkə də üstünə tənə yağacaq:
«Belə sevda hara, bu ürək hara?!»
Bilmirəm cavabım necə olacaq
Mənim bu halımı duymayanlara.

Gah işdə görüşdük, gah yolda, rizdə,
Mənə elə gəldi ayrılmazıq biz.
Keçdi xeyli müddət... Ürəyimizdə
Sən demə başqaymış istəklərimiz.

Mənəvi dünyanın sirrin nə bilək?
Fitrətin məğzini aça bilmirik.
Bir ömür bəs etmir duyub, öyrənək
Bu fani dünyada nəçiyik, kimik.

Bizdə bizdən məxfi min sirr gizlənər,
Hardan işıq alar fikrin ziyası?
İnsan bütünlükdə büllura dönər
Büllura çevrilsə ürək dünyası.

Daxili aləmdən düşən şüanın
Əksi var, nuru var əməlimizdə.
Zərrəsi olsaq da ulu dünyanın,
Bizim zərrəmizdir dünya özü də.

Bütövün dərkiyçün zərrələrə bax,
Açmaz öz sirrini bölünməsə tam.
Özündə cahanı gəzdirib, ancaq
Cahana sığmayıb Nəsimi babam.

Bir yaz ətri hopar bir udum mehə,
Zərrəyə sığışır kainat necə?
Sığar bir damlaya, bir çiçək şehə
Günəşli bir gündüz, aylı bir gecə.

Ömrümüz silədir heyrət səsiylə,
Bəzən mat qalırıq öz zirvəmizdə.
Özünün hər hansı zərrəsi ilə
Ən ulu babamız yaşayır bizdə.

Ömrün davamıdır kələn nəsillər,
Biz bir sızqasıyıq eşq adlı selin.
Onsuz da dünyada çoxdur nəhs illər.
Qoruyaq saflığı, qoruyaq gəlin!

**BƏDBƏXT GÜN**

Bu gün ömrümüzə gəlməyəydi kaş!..
Gəldi... bürünərək qara xəbərə.
Dəli əsəbimdə yavaş gəz, yavaş,
Toxunma tətikdə olan tellərə.

Bu günüm — sevdama soyuq kəfənim,
Ona ümidim də büküləcəkdir.
Çürük tora dönmüş dözümüm mənim
Əl vursan əpriyib töküləcəkdir.

Bu günü günlərin ölüsü təki
Ürək göynəmimdə basdırasıyam.
Ona bir atanın sinəsindəki
Oğul dərdi kimi yas tutasıyam.

Mənim bu istəyə haqqım yoxuymuş,
Necə anlamadım o vaxtdan səni.
Sənli ötən ömrüm şirin yuxuymuş,
Bu gün silkələyib oyatdın məni.

Oyandım...
Kaş elə oyanmayaydım!
Yuxular tərsinə yozular ancaq.
Elə közərəydim, odlanmayaydım,
İndi arzuların külünə gəl bax.

İnam sozalanda, ümid sönəndə
İtər xəyallar da, itər xülya da.
ürək özü boyda eşqə dönəndə
Dönər məhəbbətə bütün dünya da.

Gör bir neçə ili əriyib ömrün?!
Qəm yüklü bir gecə — bir qərinədir
Yolu haçalanıb ağılla səbrin
— Məndə bu bölünmə, ikilik nədir?

Sərhəd qoymaq olmaz çılğın sevgiyə,
Dedin: «Ürəyinin hökmündən əl çək!
Sənin istəyini dərk edim deyə hələ
Səkkiz il də yaşayam gərək».

Dönüb bir sərhəddə Araz çayı tək
Vüsala çatmağa qoymur səkkiz il.
Sevgini yaş ilə ölçürsə ürək
Adı ürəksə də o, ürək deyil.

Belə ayrılığa biz nə ad verək?!
Ağ əlin çırpındı ağ göyərçin tək
Hönkürür həsrətin könül tarımda.
Od tutub alışan ovuclarımda.

Səkkiz il...
Bu selin axarında mən
Gah qaya olmuşam, gah saman çöpü.
Çox vaxt dizim əsib kədər əlindən.
Elə hey bəxtimi göz yaşı öpüb.

Səkkiz il...
Ömrümün əzabı, dərdi,
Səkkiz il — enişli, yoxuşlu bir dağ.
Səkkiz il — səkkizlik elə şerdi
Hər misra bir ilə yazılıb ancaq.

Mehirli qayğını sevgi bilmişdim...
Ömrün bu yaşında yanlış zülümdür.
Gözümün yaşını təzə silmişdim,
Günahkar sənsənmi, mənəmmi, kimdir?

Zamanın axarı bahar selidir,
Götürüb aparır insan ömrünü.
Günlər — ömrümüzün pillələridir,
Son pillə — həyatın sonuncu günü.

Tökülür yarpaq tək, tökülür günlər
— Bizi ayrı salır ömrün yazından.
Mənim talehimdə bu sərt düyünlər
Sırsıra bağlayıb qəm sazağından.

Bəxtəvər naxışlı elə günlər var
Atalar deyib ki, min aya dəyər.
Bu gün yazıq sevdam dardan asılar.
Bu gün hər anımda bir qış mələyər.

## “YOX”– DEDİN...

«Yox!» — dedin...
Bu yoxda inləyər nəsə,
Vardınmı bu sözün od cövhərinə?
«Yox!» — dedin...
«Ürəkdə sevgim yox isə
Necə qurban verim ömrümü sənə?!».

«Yox!» — dedin...
Nə etsin ürəyim indi?
Arzumdan sevdama əklilmi hörüm?
«Yox!» — dedin...
Bu «yox»dan hicran sevindi,
Dünyadan bu «yox»lar yox olsun görüm!

«Yox!» — dedin...
Sən belə deməliydin də,
Kökümdən üç pöhrə qalxıb, boy atıb.
Nə deyim, bəlkə sən bilməliydin də
Bu sevda sinəmdə nə ocaq çatıb!

«Yox!» — dedin...
Bu sözün arzuma qənim,
Yandım bu istəyin qəribliyində.
Gör həyat nə günə salıb ki, məni
Həm haqlı deyirəm, həm haqsız sənə.

## HEYİF

Yazdan yaşamağa ümid gözləyən,
Düymədə çürüyən güllərə heyif!
Ömrünü mənasız ölüm izləyən
Heyif, o tökülən günlərə heyif!

Qaldı gözlərimdə murazım mənim,
Kül olub sovruldu nur arzum mənim.
Yan ürəyim mənim— tamarzım mənim,
Küləyə verdiyin illərə heyif!

Gah buluda döndüm, gah tufan oldum,
Gerçəkdən çevrilib bir güman oldum.
Dərə ürəklidən nə uman oldum?
Dərədə boğulan sellərə heyif!

Zaman sığışmadı ömrümə necə?!
Zillət şəlşlədim səbrimə necə?
Dözdün hər cəfama, cəbrimə necə?
Qəlbim, sızlatdığım tellərə heyif!

Mən arzu qoynunda binələnmişdim,
Ümidlə, inamla siləlnmişdim.
Bir sevda eşqinə nəğmələnmişdim,
Nəğməsi tükənən dillərə heyif!

Çağlayan qəhərə nə sahil, nə sədd?
Necə aparmayım gülüşə həsəd?
Bir ana əlinin mehrinə həsrət
Heyif, o göynəyən əllərə, heyif!

***Mart-avqust, 1982-ci il***

**Nəşriyyatın direktoru G. Ş. Zenalov.**

**Mətbəənin direktoru D.L. Yusifov.**

**Rəssamı N. H. YUSİFOV**

**Korrektoru Ş. O. Məmmədov,**

**Yığılmağa verilmiş 05. 05. 93. Çapa imzalanmış 20. 05. 93. Kağız formatı 70x90 7zq. Ofset kitab-jurnal kağızı. Ədəbi qarnitur. Yüksək çap üsulu. Şərti ç/v 3,5. Rəngli şərti ç/v 3,7. Sifariş № 1833 N. 1500. Qiyməti müqavilə ilə.**

**Azərbaycan Respublikası Dövlət Mətbuat Bakı, Böyük qala küçəsi 28. Komitəsi «Səda» nəşriyyatı. Mingəçevir şəhəri İcarə Poliqrafiya Müəssisəsi, Dilarə Əliyeva küçəsi, .1 a,**